**Azərbaycan Milli Elmlər Akademiyası**

**Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu**

---

**Mirzə Həsib Qüdsi**

# MEHRİBAN QARDAŞ TƏK ÜLFƏT EYLƏYƏK

**Mirzə Həsib Qüdsinin**
**175 illiyinə həsr olunur.**



**Bakı – Nurlan – 2004**

## ÖN SÖZ

XIX–XX əsr Azərbaycan ədəbiyyatının tanınmış simalarından Mirzə Həsib Əliqulu oğlu Qüdsi, mərhum Məmməd Nuru oğlunun verdiyi məlumata görə, 1828-ci ildə Bakıda anadan olmuşdur. Doğulduğu şəhərdə ibtidai təhsil aldıqdan sonra biliyini təkmilləşdirmək məqsədi ilə Tehrana getmiş, orada fars və ərəb dillərini mükəmməl öyrənməklə yanaşı, dini və dünyəvi elmlərə də dərindən yiyələnmişdir. Təhsilini bitirdikdən sonra doğma şəhərinə qayıtmış, Bakıda məktəb açmış və ömrünün sonuna kimi burada fəaliyyət göstərmişdir.

Mərhum Cəfər Rəmzinin verdiyi məlumata görə, Mirzə Həsib Qüdsi 1908-ci ildə 80 yaşında Bakıda vəfat etmişdir. Təəssüflə qeyd etməliyik ki, müqtədir şairin həyat və fəaliyyəti barədə məlumat olduqca azdır. Zəngin və çoxşaxəli ədəbi irsə malik Qüdsinin "Məktəb", "Şərqi-Rus", "Həyat", "İrşad", "Dəbistan", "Tazə həyat", "Füyuzat" və sair mətbu orqanlarda bir çox şerləri çap olunmuş, divanı 1883 və 1887-ci illərdə Təbrizdə, 1901-ci ildə Bakıda nəşr edilmişdir.

Mərhum Əliabbas Müznibin tərtib etdiyi bu kitabda şairin əsərlərindən yalnız bir qismi toplansa da, bu nümunələr onun şəxsiyyəti, dünyagörüşü, ictimai baxışları haqqında oxucuda aydın təsəvvür yarada bilir. Zəmanəsinin tərəqqipərvər ziyalılarından olan Mirzə Həsib Qüdsi elmi, maarifi yüksək dəyərləndirir və dərk edirdi ki, dünyanı cəhalətdən, xalqları əsarət və ətalətdən qurtaran elmin ziyası ola bilər, səadət və nicat yalnız elmdədir:

**Elmdir zülmati pürnur eyləyən,**
**Elmdir dünyanı mə'mur eyləyən.**
**Elmdir aləmdə xurşidi-nicat,**
**Xızri-canə elmdir abi-həyat.**

Və yaxud:

**Ey elm! Tutub aləmi-əflaki cəlalın,**

**Məhv eylədi zülmatı o xurşidi-cəmalın.**

Yüksək bəşəri ideallarla yaşayan böyük humanist şair yazırdı:

**Həqiqətdə olaq övladi-Adəm,**
**Əziyyət görməsin məxluqi-aləm.**
**Yetir, yarəb, məni mehri-nicatə,**
**Verək ta xeyr xəlqi-kainatə.**

Göründüyü kimi, şair təkcə öz Vətəninə, öz xalqına faydalı olmaqla kifayətlənmir, Uca Yaradandan iltimas edir ki, onu bütün bəşəriyyət üçün gərəkli etsin. Bəli, Mirzə Həsib Qüdsi ədəbiyyat və ictimai fikir tariximizdə hər şeydən əvvəl bu böyük və nəcib arzusu ilə fəxri yer tutmağa layiqdir.





## DUA

Çünki məxfiydi gənci-gühərzat,
Cilvə qıldı göründü nuri-sifat.
Bəs ədəmdən kənarə gəldi vücud,
Aldılar feyz cümleyi-mövcud.
Ənbiyalər olubdu hadiyi-rah,
Olmasın xəlq həqdə gümrah.
Ta tülu etdi mehri-aləmtab,
Oldu pürnur qəlbi-əhli-kitab.
Olmadı müşrikini-bədfitrət,
Layiqi-feyzü qabili-rəhmət.
Nur ilən zülmət oldular düşmən,
Nə qədr vardu dövri-çərxi-kühən.
Nikolay cilvələndi dövranə,
Gəldi yapon onunla meydanə.
Eyləməz tab müşriki-məğrur,
Hər zəman əhli-din olub mənsur.
Əbr mehri-müniri tar eylər,
Nur zülmati tarümar eylər.
Bəxti-şahənşəhi-qədri-qüdrət,
Vuracaq çərxə rayəti-nüsrət.
Ahəninpuş, şirdil ləşkər,
Olu yə’cucə səddi-İsgəndər.
Döndü şətrəncə səthi-ərseyi-cəng,
Seyri-meydan olub səvarəyə təng.
Filtən, kəc xəyal edib əzmə,
Hər piyadə tutubdu rüx rəzmə.
Kurapatkinin əqli-fərzini,
Edəcək mat şahi-bidini.
Küfr yəcucinə çəkər səddi,
Edəcək hifz cümlə sərhəddi.

Bizə vacib edibdü bihəmta,
Eyləyək padşahə xeyr-dua.
Eyləyim mən dua beqəlbi-həzin,
Deyin, ey qövm, sidqilən amin!
Ey Xuda, saxla cümlə sərdarın,
Rəzmdə ləşkəri-vəfadarın.
Lütfi-həq padşahə yar olsun
Ki, bu duadə kamkar olsun.
Hazır eylibdü xaməsin Qüdsi,
Yazmağa fəthnaməsin Qüdsi.

*1904*

## TƏHNİYƏT

Mərhəba, ey nameyi-şirinsüxən,
Səndən oldu şad əbnayi-vətən.
Xızrdır xamən ki, zülmati-dəvat,
Zövqlən hər dəm içər abi-həyat.
Ya ki, bir qəvvasdır sahibhünər,
Bəhrdən xaric edir dürri-gühər.
Çöhrədən ya ki, salır hərdəm niqab,
Dəf' edir zülmati qürsi-afitab.
Çün xədəngi-tə'nəyə amac idik,
Qeyriyə əxbar üçün möhtac idik.
Möhbiti-əxbari-raz etdin bizi,
Qeyrlərdən biniyaz etdin bizi.
Kürreyi-ərzin edər sirrin əyan,
Hüsni-təqrir ilə darayi-cəhan.
Qəlbə bir seyqəldir əxbari-cədid,
Dəmbədəm ruhun olur zövqi məzid.
Lütf elə, ey Xudavəndi-qədim!
Cismi-aləmdə "Həyat" olsun müqim.
Xürrəm olsun gülşənü gülzari-Qüds,
Ruhə gəlsin əndəlibi-zari-Qüds.

*1905*

## MEHRİBAN QARDAŞ KİBİ RƏFTAR EDƏLİM

Ta ki əmr etdi Xudavəndi-vədud,
Pəs ədəmdən ərsəyə gəldi vücud.
Ənbiyani hadiyi-rah eylədi,
Şərrdən məxluqi agah eylədi.
Hər kitab oldu siratəl-müstəqim,
Ol sirati-həqqə xəlq olsa müqim.
Eyni məqsudə yetər aləm təmam,
Kəşf olur əsrarlər ruzi-qiyam.
Biz Xudavəndi-bərinə bəndəyiz,
İntəhasız lütfinə zibəndəyiz.
Hər dililə hübbi xəlq etsə əda,
Qəlbi-əsrarına vaqifdir Xuda,
Ey rəisi-pişvayani-miləl,
Biz nə lazımdır edək bəhsü cidəl.
Elmdir zülmati pürnur eyləyən,
Elmdir dünyanı mə’mur eyləyən.
Elmdir aləmdə xurşidi-nicat,
Xızri-canə elmdir abi-həyat.
Elm ümuri-xəlqi rahət eyləsin,
Bəzmi-xassi-vəslə də’vət eyləsin.
Əşrəfi-məxluqdur növ’i-bəşər,
Salmasa afaqə gər bin şurü şər.
Elm olan yerdə olur helmü ədəb,
Görməz ondan xəlq azarü təəb.
Cəhd edin, ey sahibani-əqlü huş,
Atəşi-qəhrü qəzəb olsun xəmuş.
İşrəti-dünyanı bərhəm etməyin,
Cənnəti eyni-cəhənnəm etməyin.
Hər iki millət edin fikrü xəyal,
Mənfəət verməz bizə cəngü cidal.
Mehriban qardaş kibi rəftar edin,
Bir-birilən sidqilən göftar edin.
Qoymayın bir də fəsad etsin zühur,
Cümleyi-afaqi tutsun şərrü şur.
Çün bizə iblisdir xəsmi-mübin,
Vəsvəsə etdi o məl’uni-ləin.
Oydu Qabil, Habili etdi həlak,

Xəncərin altında can verdi o pak.
Yusifə qardaşlar etdi zülmü kin,
Qaldı qə'ri-çahdə mehri-yəqin.
Hər iki millətdə vicdan qalmadı,
Hörməti-İncilü Qur'an qalmadı.
Etmədik qəhri-Xudadən xofü bim,
Zarü giryan qaldı ətfali-yetim.
Oldu zülm angəh pərəstarı onun,
Qəm günündə yarü qəmxari onun.
Qaldılar biçarələr bixaniman,
Taği-gərdunə yetir ahü fəğan.
Xəlqdə bir istirahət qalmadı,
Eyşi-işrət, eyni-rahət qalmadı.
Hər yana baxsan geyib aləm qəra,
Eylədik Qafqası biz matəmsəra.
Hansı millətdə rəvadır bu cəfa,
Eyləyin insaf, ey əhli-vəfa.
Vay o gündən ki, olur yövmi-hesab,
Həqq edər məxluqə qəhr ilə xitab:
"Siz bənim əmrimcə taət etmədiz,
Sidqi qəlbilə ibadət etmədiz.
Nəfsi-əmmarə sizə oldu əmir,
Eylədiz cəngü cədəl, qövmi-şərir.
Hansı hökmümdə sizə qıldım xitab,
Eyləyin məxluqə zülm, əhli-kitab!
Məscidü deyri-səfanı yandırın,
Mə'bədü beyti-Xudanı yandırın.
Eyləyin İncilü Qur'anı zəlil,
Heç olur razi buna Rəbbi-cəlil?
Eylədüz divani-məhşərdə məqam,
İndi lazım sizdən almaq intiqam".
Sə'y edin, ey pişvayani-miləl!
Olmasın millət içində bir cədəl.
Qütb tək sabit olun qövmi-cəsur,
Ta səhulətlə mədar etsin ümur.
Rahi-həqqə xəlqi də'vət eyləyin,
Cümlə məxluqə nəsihət eyləyin.
Ey xoş ol günlər, rəfiqü yar idik,

Həmdəmü həmrazü həmgöftar idik.
Heyf oldu tirə mehri-ittifaq,
Aləmi yandırdı nirani-nifaq.
Qüdsiya, mülki edər azadü şad
İttihadü ittihadü ittihad.

*1905*

## ƏL-ELMÜ ELMAN: ELMÜL-ƏBDAN, ELMÜL-ƏDYAN*

Gövhəri-yekdaneyi-gənci-səfa,
Afitabi-ərşi-iman Müstəfa.
Eyləyibdir şafe'i-yövmən-nüşur,
Elmi-əbdan ilə ədyanı zərur.
Elmi-əbdani müqəddəm qıldı şah,
Kəşf ola məxluqə ta sirri-İlah.
Bu sözə iqrar edər əhli-yəqin,
Səhhətə vabəstədir ehkami-din.
Eyləyə bilməz əda bimari-zar,
Ruzəvü həccü nəmazü karzar.
Təndə bəs elmilə can məsrur olar,
Kişvəri-dinü miləl mə'mur olar.
İldə bir dəf'ə bədən olmaz əlil,
Ta həkim olsun o bimarə dəlil.
E'tidalından düşər hər gün məzac,
Fəqr dərdinə təbib etməz əlac.
Olmasa ruhə məişət xəstədir,
Səhhəti simü zərə vabəstədir.
Şiddət etdikcə bədəndə dərdi-cu',
Eyləyə bilməz ibadatə rücu'.
Əhli-dil, bu nüktədir cani-kəlam,
Elmi-əbdandır sənaye'lər təmam.
Elm eylər ixtiraati-cədid,
Elm eylər məknətü cahi məzid.
Dövlət ilə tapdı rövnəq kainat,
Sahibi-dövlət verir xümsü zəkat.

---

* Elmlər iki növdür: cismani elm, ruhani elm (Hədis).

Fəqrdən zahir olur rəncü əna,
Əğniyalər eyləyir məscid bina.
Zahirən bimar olmaq səhldir,
Müstəqil illət, bədəndə cəhldir.
Xəlqi-aləmdir hamı möhtaci-elm.
Şahdir həm başda olsa taci-elm
Eyləyin təhsili-elm, əhli-zəmən,
Eyni-iman oldu çün hübbi-vətən.
Elmilə məxluqi dilşad eyləyin,
Elmilə dünyanı abad eyləyin.
Cilvələnsin aləmə rüxsari-Qüds,
Zülməti rəf' eyləsin ənvari-Qüds.

*1905*

## MÜXƏMMƏS

*Riyazi-məkatibdə məqam edən əndəlibani-əbnayi-millət üçün gülzari-səfayi-Qüdsdən bir dəstə gül və nəsimi-bəhari-həqiqətdən şaxsari-mə'rifətdə məkşuf olan qönçələrin həvasində xoşnəva bülbüldür.*

Səmatdən bizə nazil olubdur ayəti-elm,
Yetirdi ərşə bizi valiyi-vilayəti-elm,
Vilayət əhli bilir ki, nədir hidayəti-elm,
Hidayət əhlinə şamil olur inayəti-elm,
İnayət olsa, bilir ki, nədir həqiqəti-elm.

Əzəldə əqli edib xəlq iyzədi-davər,
Təmam firqeyi-mövcudə oldu peyğəmbər,
Onun kəmalına vabəstədir qəzavü qədər,
Cəmii-aləm ərzdir, o nurdur cövhər,
Olubdur illəti-qaiyi-vücud fitrəti-elm.
Bu afitab eylədi ərşü fərşi nurani,
Vücudi-cövrü cəfani bu ədl edib fani,
Bu mehrə mətlə' olubdur vücudi-insani.
Odur ki, şə'şə'eyi-nuri tutdu dünyani,
Götürdi kəsrəti-zülmati nuri-vəhdəti-elm.

Görün bu fitrədə vardır nə qədr iste'dad,
Özündən eyləyir aləmdə şey'ilər icad,
Təmam sahəti-imkanı eyləyib abad,
Qəmini-qəlbləri qeyddən qılıb azad,
Tutubdu cümleyi-afaqi sövti-şöhrəti-elm.

Ümuri-aləmi-imkan bununla tapdı rəvac,
Miyani-məhfili-heyrətdə yandırubdu sərac,
Bu şahə cümleyi-məxluqlər olub möhtac,
Yəqinən olmayacaq hiç şəxs sahibi-tac,
Başında olmasa ta əfsəri-səadəti-elm.

Mədid oldu bu qəflət zəmani əhli-şüur,
Həyat tapmağa qövmi-məmat olub məcbur,
Behişt xəlqi bu mizandan eyləyirlər übur,
Yığıldı məhşəri-süğrayə cümlə əhli-qübur,
Çalındı sur, qiyam eylədi qiyaməti-elm.

Vücudə etməyə tə'sir ta ki, zəhri-məmat
Ki, Xızr xamə verir xəlqə cami-abi-həyat,
Qalan o zilləti-heyrətdə tapdı rahi-nicat,
Tülu'i-şəmsdə, əlbəttə, rəf' olur zülmat,
Cəhani eylədi pürnur mehri-təl'əti-elm.

Xilafi-qütb mədar etdi gərdişi-aləm
Ki, qaldı dami-təhəyyürdə firqeyi-adəm,
Odur, hidayətə əshabi-elm qoydu qədəm,
Sipahi-zülmətü cəhlin vücudi oldu ədəm,
Səmadə mehr kibi şəqqə açdı ra'yəti-elm.

Nə qədr eyləsə xəsmani-cövrpişə kəmin,
Xərab eyləyə bilməz bu səddi seyli-zəmin,
Vücudi-aləmi-imkanədir həsari-mətin,
Tüyur cani-əduni edər şikar yəqin,
Açanda şəhpərini şahbazi-nüsrəti-elm.

Nəzarə eyləginən teleqrafü telfunə,
Çəkildi cədvəli-xətti həsari-hamunə,
Olubdu naqili-əsvat sirri-məknunə

Ki, Xəlqi vaqif edər hər dil ilə məzmunə
Ki, Şərqdən yetişir Qərbə sövti-söhbəti-elm.

Qutardılar neçə milyon xəyuli-zəhmətdən
Ki, asiyabdə hər sübhü şam möhnətdən,
Olurdu dövreyi-gərdişdə zar kurbətdən,
Maşini-dəyirmani gəldi zühurə qeybətdən
Ki, saldı aləmi pərgarə qütbi-rəhməti-elm.

Elektrik edib afaqı mehr tək pürnur
Ki, oldu neft çirağı xəcalətindən kur,
Vaqon qətarləri bərq tək edəndə übur,
Ərabələr ona tab etmədi olub məqhur,
Şikəst verdi onun çərxinə səlabəti-elm.

Qramafon deyir, ey milləti-əzizü kiram,
Görün nə növ' tərəqqi edib bütün əyyam
Ki, "torpid" ilə gəzir qə'ri-bəhri xəlq təmam,
Balonla övci-səmayə edər sə'ud müdam,
Əyan eylədi əsrari xəlqə hey'əti-elm.

Gərək bina ola hər yerdə məktəbi-ali,
Bu xeyir işdə edək sərf dövlətü mali,
Müəllim ilə olur çün mükəmməl əqvali
Ki, qoymayın qala zillətdə fövci-ətfali,
Qəni edər onu aləmdə gənci-dövləti-elm.

Ülumə cəhd eləyən qurtarar məsaibdən,
Baxanda surətə mə'na görər mətalibdən,
Xülasə, sə'y eləsə, feyz alar mühasibdən,
Gedib xərid eləsə bəndəri-məkatibdən,
Ziyadə nəf' verər aləmə ticarəti-elm.
Görürdü şərqdə şəmsi-səfa olub məstur,
Bilirdi dövr edəcək çox zəman səninü şühur,
Buyurdu, Çinə gedin elm üçün, cəmaəti-nur,
Miqadü əsrini sultani-din tutub mənzur,
Göründü mətlə'i-Qüdsiyə çün nəhayəti-elm.

*1905*

## ÜLFƏTDƏN

Gəlir tərənnümə bülbüli-bəhar-ülfətdən
Güli-murad açılır şaxsari-ülfətdən.

Cəhandə qəlb ədavətlə dağdar olmaz,
Əgər güzar eləyə laləzari-ülfətdən.

Xədəngi-qəmzeyi-dilduz ilən kəmanəbru,
Qılıb aləmi eylər şikar ülfətdən.

Məhaldır yetə Cəmşid mehri-novruzə,
Müsavi olmasa leylü nəhar ülfətdən.

Xülasə, sidqi-məqal ilə buteyi-dildə,
Təlayi-qəlb olur eyni-əyari ülfətdən.

Zəmiri-ayinəsin görsə jəngdən xali,
Gəlir təcəlliyə mehri-nigar ülfətdən.

Həzar seyli-bəla qəl’əni xərab eləməz,
Binası olsa əgər paydar ülfətdən.

Nəvayi-şur müxaliflər eyləməz ağaz
Ki, görsə şəhrə çəkilmiş həsar ülfətdən.

Zəlili-xar edər milləti cəhandə nifaq,
Səadət əhli olur kamkar ülfətdən.
Cəhani tiği-şərərbar ilən tutar ləşkər
Ki, məşvərət edə gər şəhriyari-ülfətdən.

Xəta degil bu sözə qövmi-Çin edər iqrar,
Qəzali-xamə olur mişkbari-ülfətdən.

Edər cəhani müəttər nəsimi-gülşəni-Qüdsi,
Təravət alsa əgər xuybari-ülfətdən.

Əhmədü Məhmudü xətmül-mürsəlin,
Afitabi-bizəvali-ərşi-din.
Hər cəhadə şahi-din qoydu qədəm,
Şəqqeyi-fəthü zəfər açdı ələm.
İqtidarı dəmbədəm oldu ziyad,
Düşdü dami-heyrətə əhli-fəsad.
Altı il bi’sətdən etmişdi güzar
Kim, Əbu Süfyan bu növ’ etdi qərar.
Cəm' qıldı yarü ənsarın təmam,
Qətli-şahi-din üçün etdi qiyam.
Kişvəri-qəlbin inad etdi xərab,
Qövmi-üdvanə belə qıldı xitab:
"Qorxuram Əhməddən ey qövmi-zəlal,
Tapsa quvvət, eyləyər, cəngü cidal.
Gər məded etsə ona bəxti-cəmil,
Latü Üzzani edər xarü zəlil.
Vardır aya bir nəfər sahibcəlal,
Eyləsin bu nuri-paki paymal".
Çün Ömər məşhuri-xasü am idi,
Hər qəbayil içrə sahibi-nam idi.
Cövhəri-tiği-rəşadətdi özü,
Gövhəri-dürci-bəlağətdi sözü.
Dustarü düşmənin şadü qəmin,
Eyləyirdi dəmbədəm şiri-qərin.
Bəzmdə şirin olan göftar ilə,
Rəzmdə şəmşiri-bərqasar ilə.
Vardı mir’atında çün jəngi-cəfa,
Salmamışdı əks ona mehri-səfa.
Batinən qəlbində gərçi vardı nur,
Leyk zahirdə çox eylərdi nəfur.
Çün eşitdi bu sözü ənsar Ömər,
Sahibi-şəmşiri-bərqasar Ömər,
Dedi, ey Süfyan, mən etməm bimü bak,
Əhmədi şəmşir ilən qıllam həlak.
Qeyzi-xəşm ilə o salari-cəhan,

Əhmədi öldirməyə oldu rəvan.
Yolda bir əhbab alıb ondan xəbər:
“Hansı də’vayə gedirsən, ey Ömər?”
Dedi, əzmim vardı tufan eyləyim,
Xaneyi-islami viran eyləyim.
Gər bənə yavər ola Latü Həbəl,
Qoymaram qalsın o xurşidi-miləl.
Dedi əhbab: “Ey dəliri-namvər,
Xahərin islam olubdur, ey Ömər!
Get özün əvvəl ona bir çarə qıl,
Sonra gəl bu Əhmədi-Muxtarə qıl”.
Oldu çün agah ol sahibzəmir,
Xahərin mən’ etməyə getdi dəlir.
Çün yetişdi babə mərdi-durbin,
İstima’ etdi Ömər sövti-həzin.
Bildi ki, Qur’an oxur qövmi-səfa,
Əndəlibi-səhni-gülzari-vəfa.
Şö’ləlindi atəşi-qəhrü qəzəb,
Beytə daxil oldu salari-ərəb.
Gördülər mərdi-cəhanara gəlir,
Qəhrdən bitabi-bipərva gəlir.
Bildilər çünki edər cəngü cədal,
Lövhi pünhan etdilər əhli kəmal.
Dedi: “İslami neçin etdiz qəbul,
Siz nə bildiz ki, budur xətmi-rəsul?
Talibi-didari-sərməd olmusuz,
Aşiqi-rüxsari-Əhməd olmusuz.
Ey baci, qıl tərki-dini-Müstəfa,
Dəyməsin ta ki, sana tiği-cəfa”.
Çün eşitdi bu sözü nuri-mübin,
Dedi: “Ey danayi-qövmi-əhli-kin.
Aşiqi-canan olan can istəməz,
Canə mail ölsa, canan istəməz”.
Çün eşitdi bu sözü salar Ömər,
Qeyzləndi sərvəri-nikusiyər.
İstədi əvvəl edə zövcin həlak,
Vurdu bir şəmşir mərdi-səhmnak.
Hail oldu tiğinə mahi-üməm,

Dəyməsin ta zövcinə tiği-sitəm.
Xahərin fərqini şəmşir etdi şəqq,
Tutdu mehri-arizin xuni-şəfəq,
Basdı qan seylab tək gül çöhrəsin.
Gördü çün ol halda həmşirəsin,
Yandı qəlbi-zarı baçeşmi-pürab.
Bağladı zəxmin ona qıldı xitab:
“Bu nə səhbadır ki, məst etmiş səni,
Talibi-bəzmi-ələst etmiş səni.
Sən məni bu sirdən agah elə,
Eyni-zülmətdə qərini-mah elə.
Dur gətir Qur’anı, qəmxarım bacı,
Bir görüm ayatı, dildarım bacı”.
Dedi: “Gər qəlbilə etsən ehtiram,
Verrəm əlvahi sana yari-giram”.
Aldı çün lövhi tilavət eylədi,
Zövqi-qəlbilə qiraət eylədi.
Cilvələndi qəlbinə ayati-nur,
Ayeyi-nur eylədi zülmati dur.
Eyni-zülmətdə tapıb rahi-nicat,
Xızra can bəxş eylədi abi-həyat.
Kühli-iman çeşmini pürnur edib,
Mehri-canan qəlbini məsrur edib.
Eylədi tə’sir Qur’ani-mübin,
Həqqə iqrar eylədi sahibyəqin.
Cəzbeyi-ahənrübayi-hüsni-yar,
Etdi qəlbi-aşiqi biixtiyar.
Eşqi tüğyan etdi başurü fəğan,
Seyl tək dərya üçün oldu rəvan.
Çün yetişdi babə izn aldı Ömər,
Oldu daxil cənnətə sahibhünər.
Əvvəla ərz etdi: “Ey xeyrülənam!
Qorxmasın məndən de, əshabi-kiram.
Məndə bir zərrə ədavət qalmadı,
Nurə yetdim, cəngi-zülmət qalmadı.
Aşiqi-hüsni-nigarəm, ya Rəsul!
Maili-dildari-yarəm, ya Rəsul!

Qütbi-rəhmət saldı pərgarə məni,
Qoymadı heyrətdə avarə məni.
Div idim, indi Süleyman olmuşam,
Küfr idim, eyni-müsəlman olmuşam.
Aləmə mehri nümayan eylərəm,
Canımi rahində qurban eylərəm.
Xar idim, gülzari-izzət olmuşam,
Zağ idim, şəhbazi-nüsrət olmuşam.
Cümlə məxluqə dəlili-rahsən,
Agəh oldum, sən rəsulullahsən.
Eylərəm iqrar baqəlbi-səlim,
Yoxdur Ondan qeyri xəllaqi-əlim".
Çün şəhadət kəlməsin qıldı bəyan,
Bildilər islam olub şiri-jəyan.
Dini-islami Ömər etdi qəbul,
Oldular məsrur əshabi-Rəsul.
Şad oldu sərvəri-əhli-yəqin,
Əllərin tutdu səmayə şahi-din.
Şükri-Həqqi eylədi əvvəl əda,
Sonra lütf ilə ona qıldı nida:
"Gəl görüm, ey saliki-rahi-vəfa,
Tapdı rövnəq dini-paki-Müstəfa.
Növbəti-fəsli-bəhar oldu bu gün,
Səhni-gülşən laləzar oldu bu gün".
Zöhr vəqti durdu xurşidi-Hicaz,
Evdə əshab ilə ta qılsın nəmaz.
Şahə tə'zim eylədi nikusiyər,
Pəs Ömər ərz etdi: "y xeyrülbəşər,
Kə'bə dövrində küffari-ərəb,
Taətə məşğul olurlar ruzü şəb.
Xaneyi-xəlvətdə basuzi-güdaz,
Biz olaq, ey şah, məşğuli-nəmaz.
Ərşi-yektayi-inayətsən bizə,
Eyni-xurşidi-hidayətsən bizə.
Şəms eylər dəmbədəm seyri-büruc,

Sən də, ey mehri-həqiqət, qıl üruc.
Dur gedək beyti-Xudayə, ya Rəsul!"
İltimasın şahi-din etdi qəbul,
Sərvi-din izhari-qamət eylədi,
Bir qiyami bin qiyamət eylədi.
Durdu sağında onun mehri-cəli,
Afitabi-peyrüvani-din Əli.
Tutdu sulətlən o şiri-kirdigar,
Qəbzeyi-qüdrətdə tiği-zülfiqar.
Sol tərəfdə Həmzeyi-ə'dafəkən,
Şəhsüvari-namdari-əncümən.
Çəkdilər səf dalda əshabi-ülum,
Ərşə zivər oldu əfvaci-nücum.
Bəs qabağcə düşdü ənsar Ömər,
Əldə şəmşiri-şərərbar Ömər.
Cəhri-sövtilə dəliri-namdar,
Şəhsüvari-karzari-ruzgar.
Səslənirdi ərşi-sərməddir gələn,
Afitabi-dini-Mühəmməddir gələn.
Gövhəri-gəncineyi-yekta idi,
Məzhəri-ənvari-bihəmta idi.
Rahdən, ey qövmi-zülmət, dur olun,
Ya gəlin imanə eyni-nur olun.
Firqeyi-əshab edəndə həlhələ
Düşdü qəlbi-qövmi-küfrə zəlzələ.
Qalibi-biruh oldu əhli-kin,
Bəs Əbu Süfyan olub zarü qəmin.
Dövri-beytullahdə mehri-Hicaz,
Bəs o gün qıldı cəmaətlən nəmaz.
Tapdı rövnəq dəmbədəm əhli-yəqin,
Cilvələndi afitabi-ərşi-din.
Nuri rövşən etdi çərxi-ətləsi,
Ərşü fərşi tutdu islamın səsi.
Verdi rövnəq dinə çün xeyrülənam,
Əzmi-firdovs eylədi ali məqam.

Həzrəti-Bubəkr idi çün yari-qar,
Pəs xilafətdə olubdur bərqərar.
Ziynətül-mehrabü minbərdir Ömər,
Zülmətə xurşidi-ənvərdir Ömər.
Mərdi-dana fikrü tədbir eylədi,
Aləmi tiğ ilə təsxir eylədi.
Nuri-zünnureynidən oldu cəhan
Rəşk, səhni-gülşəni-bağı-cinan.
Aləmi pürnur edib mehri-cəli,
Afitabi-dinü imandır Əli.
Eyləyib tövsif onu Rəbbi-cəlil
Hələtadır xəlqə bürhani-dəlil.
Çün bilir bu sirri hər sahibnəzər,
Vəsfinin şərhində acizdir bəşər.
Qibleyi-islam oldu paydar,
Çar ərkan idi, çünki çaryar.
Dinə rövnəq verdi qövmi-raşidin,
Getdilər bəzmi-vüsalə cahidin.
Ta ki, ümmətdə vardı ittihad,
Məmləkət mə’mur idi, əhbab şad.
Çünki bərhəm oldu nəzmi-ittifaq,
Xərməni-islamə od saldı nifaq.
Afitabi-rövnəqi-islamiyan,
Oldu zülmati-ədavətdə nihan.
Şahbazi-nüsrət oldu paymal,
Zaği-zülmət çərxə açdı pərü bal.
Hail oldu şəmsə ta ərzi-kəsif,
Bədri-millət dəmbədəm oldu zəif.
Mehrü mahi-şər'isüz əhli-ülum!
Aləmi-surətdə ümmətlər nücum.
Siz olubsuz, varisani-ənbiya,
Canişini-övliyavü övsiya.
Hadiyani-rahi-rəhmətsüz bizə,
Pişvayani-şəriətsüz bizə.
Bir baxın diqqətlə millət halinə,

Rəhm edin bu ümmətin əhvalinə.
İqtidarü səbrü taqət qalmadı,
Zə’f qalib oldu, qüvvət qalmadı.
Dövri-xurşidə əbr oldu mühit,
Təng oldu bizlərə xaki-bəsit.
Feyzdir, sə’din etsə iqtiran,
Ta ki, nəhsinin şərri nihan.
Dövri-gərdun, iqtizayi-ruzgar,
Eylədi sirri-nihani aşikar.
Vadiyi-heyrətdədir əhli-səfa,
Çar canibdən gəlir seyli-cəfa.
Olmasa mərsus bünyanü dad,
Aləmi viran edər seyli-fəsad.
Hiyleyi-ə’dadən agah olmuşuq,
Ol səbəbdən yarü həmrah olmuşuq.
Seyqəli-mehr eylədi mir’ati saf,
Qəlblərdə qalmadı jəngi-xilaf.
Müftilər, nuri-Xudasuz bizlərə,
Müctəhidlər, müqtədasuz bizlərə.
Sizdən eylərlər bu gün cümhuri-nas,
İltimasü iltimasü iltimas.
İndi imdadü himmət vəqtidir,
Eyni-iltafü müvəddət vəqtidir.
Hasili iqdam edin, əhli-kəlam,
Peyrəvi olsun sizə ümmət təmam
Mehriban qardaş tək ülfət eyləyək,
Mehr ilən tərki-ədavət eyləyək.
Ləfzi-“sünni-şiə” dildə qalmasın,
Aləmi bəhri-bəlayə salmasın.
İktifadır nuri-sərməd millətə,
İttifaqi-dini-Əhməd millətə.
Cilvələnsin aləmə nuri-yəqin,
Artıraq dini-mübinin rövnəqin.
Təhniyətçün Qüdsiyani-bəzmi-yar
Əxtərani-çərxi etsinlər nisar.

*1906*

## HADİYİ-TƏRİQİ-MÜBİN, MÜQTƏDAYİ-ƏHLİ-YƏQİN, CƏNAB NƏCMƏDDİN ƏFƏNDİMİZİN HÜZURİ-BAHİRİN-NURLƏRİNƏ İSTE'DANAMƏDİR

Qürub etsə əgər afitabi-ərşi-bərin,
Cəhani rövşən edər nuri-qürsi-mahi-mübin.
Səhabə əncümü əxtərdir, afitab Nəbi,
Kəvakib ilə müzəyyən olur sipehri-yəqin.
Dəlil olmağa zülmətdə əhli-imanə,
Hidayətin fələyindən göründi Nəcməddin.
Təlatüm eylədi dəryayi-elmü rəhməti-Həq,
Kənarə atdı odur ki, cəvahirati-səmin.
Nifaq seyli xərab etdi şəhri-imani,
Müvəddət ilə çəkilsin gərək həsari-mətin.
Rəvami, zaği-zəğən gülşəni məqam eləsin,
Qala kənardə tavusi-baği-əliyyin.
Gər ittifaq ilə hər ixtilafı dəf’ edəsiz,
Rəhini-minnət olur sakinani-ruyi-zəmin.
Mü'in olur sizə ərvahi-çaryari-kiram,
Ənis olur sizə məhşər günü Rəsuli-əmin.
Əgər ki, rəf’i-niqab etsə nogüli-Qüdsi,
Gəlir tərənnümə gülşəndə bülbüli-Qüdsi.

*1906*

## BİSMİLLAHİR-RƏHMANİR-RƏHİM

*Ya eyyuhən-nəbiyyü inna ərsəlnakə şahidən və mübəşşirən və nəzirən və daiyən ilallahi-bi-iznihi və siracən münirən və bəşşirənli-möminin biənnə ləhüm minəllahi fəzlən kəbirən.*[*]

*Xazini-gəncineyi-həqiqət, kaşifi-əsrari-hikmət ə’niyi afitabi-aləmtabi-ərşi-əstafa, Mühəmmədəl-Müstəfa, (S.Ə.) məşriqi-hidayətdən tülu’ etməyinin*

---

[*] Ya peyğəmbər! Həqiqətən, Biz Səni bir şahid, bir müjdəçi və bir qorxudan kimi göndərdik! Biz səni Allahın izni ilə Ona tərəf çağıran və nurlu bir çıraq olaraq göndərdik! Möminlərə Allah tərəfindən böyük bir mükafat bəxş ediləcəyi ilə muştuluq ver! (Əhzab surəsi, 45-47-ci ayələr).

*əyanında və siyqəli-ülum ilə jəngari-cəhli-küfrimir'ati-qülubi-əhli-səfadən rəf'ü ümumi-məxluqatı təhti-livayi-tövhidə də'vət qılmağın bəyanındadır.*

## QƏZƏL

Əgər ki, feyz ala fövci-rical himmətdən,
Yəqindü qəl' olacaqdır cibal himmətdən.
Həsari-Çin xəta əhlin etmədi məhfuz,
O şəhri xəsm elədi paymal himmətdən.
Cəhani rövşən edər neyyireyni-elmü əməl,
Ələlxüsus edələr ittisal himmətdən.
Riyazi-dildə müvəddətlə etsələr peyvənd,
Səmər zühurə gəlir nonihali-himmətdən.
Qürab fövci necə tab edər əgər şəhbaz,
Fəzayi-çərxə açar pərü bal himmətdən.
Hər ay başında ki, bir şəhri eyləyir təsxir,
Sipehri-rəzmdə tiği-hilal himmətdən.
Rəsul çiyninə qoydu qədəm Əli, vəli,
Yetişdi ərşə o mehri-cəlal himmətdən.
Salındı bami-hərəmdən yerə çü Latü Həbəl,
Bilal eylədi naqusi lal himmətdən.[1]
Fəzayi-aləmi-Qüdsi müəttər eyləyəcək,
Güzar eyləsə mişkin qəzal himmətdən.

*1906*

## XƏLQİ-ZƏMANƏ

Zülmati-cəhalətdə idi xəlqi-zəmanə,
Məstur idi məxluqlərə nuri-yeganə.
Bir əhli-səfa yoxdu edə kəşfi-dəqayiq,
Bəs badiyeyi-cəhldə heyrandı xəlayiq.
Ənvayi-təsəvvürlər edib fikri-səqimə,
İqrar eləyən yoxdi Xudavəndi-qədimə.
Beş tayifə vardı, ikisi nur ilə zahib,
Üç tayifəsi müşrik idi, zülmətə talib.
Tabe'di iki firqəsi əhkami-hənifə,
İncili-müqəddəsləvü Tövrati-şərifə.

---

[1] Məkkənin fəthindən sonra bütlərin düşürülüb qırılmasına işarədir (Ə.M.).

Dəhr iydi, yəhudidi, nəsara idi şaye',
Həm atəşilən bütlərə məxluq idi tabe’.
Bica yerə inkar elədi xaliqi-dəhri,
Məxluqə mürəbbi bilib aləmdə sipəhri.
Əql əhli bu bir nüktəyə tabe’ gərək olsun,
Məxluqdur aləm ona sane’ gərək olsun.
Xəlq etməyə qadirmi, degil, Rəbbi-yeganə,
İbrətlə nəzər eylə bu məxluqi-cəhanə.
Çün baxmadı diqqətlə yəhud ilə nəsara,
Görsün necə pəs xəlq eləmiş adəmi Dara.
Çün atəş ilən büt bizə məscid ola bilməz,
Biruh həyat əhlinə mə’bud ola bilməz.
Bir böylə zəmanda gəlib ol xaceyi-məs’ud,
Xurşidi-hüda, ərşi-səfa, Əhmədü Məhmud.
Şəqqə açıb əflakə livayi-əhədiyyət,
Pürşur olub vəhy ilə nayi-əhədiyyət.
Mö’minləri məsrur elədi şurü nəvasi,
Zülmati münəvvər elədi mehri-hüdasi.
Miftahi-zəbanilə o gəncuri-hidayət,
Gəncineyi-əsrari açıb etdi inayət.
Pürmövc olub bəhri-gühərzayi-Məhəmməd,
Tökdi gühəri sahilə dəryayi-Məhəmməd.
Hər şəxs olub gövhəri-əsrarına məhrəm,
Miskini qəni eylədi şahənşəhi-ə’zəm.
On üç il edib Məkkədə məxluqi hidayət,
Bir neçə nəfər oldular ərbabi-səadət.
Xəffaş nə bilsin ki, nədir mehri-cəhantab,
Didarına yox dideyi-xəffaşdə çün tab.
Jəngardən olsə könül ayinəsi xali,
Ayineyi-dildə görünür əksi-cəmali.
Elm ilə müsəxxər elədi mülki-cəhani,
Dərk etmədi cəhl əhli o əsrari-nihani.
Hökm oldu gedə Yəsribə sultani-cəhandar,
Orda olacaqdır gühəri-dinə xiridar.
Müştaq idi gəlməyliyinə əhli-Mədinə,
Can gövhərin isar edələr sərvəri-dinə.
Əzm eylədi xurşidi-həqiqət o diyarə,
Halə kibi ətrafına cəm’ oldu sitarə.

Pəs iki qəbilə, biri Xəzrəcdi, biri Övs,
İman gətirib oldular ol sərvərə mə'nus,
Ənsar ibarətdi iki qövmi-vəfadən,
Nur aldı qəmər ərşdə xurşidi-səfadən.
Çün qıldı vəfa əhlini pürnur Məhəmməd,
Afaqi münəvvər elədi nuri-Məhəmməd.
Helm ilə edib zövqü səfa əhlini dilşad,
Elm ilə edib bəzmi-vəfa qövmini irşad,
Pəs dürci-gühərbarın açıb xazini-rəhmət,
Əhbabə xitab eylədi salari-nübüvvət.
İxlas təriqin sizə mən eyləyim izhar,
Agah olun əsrardən, ey firqeyi-ənsar.
Hər bəndeyi-mö'min edər iqdam nəmazə,
Çün niyyətü təkbir dedi, gəldi niyazə.
Ol dəmdə qoyar xahişi-nəfsini kənarə,
Pərgarsifət seyr edər qütbi-fikarə.
Heç fikrü xiyal eyləməz əfkarını bərhəm,
Bilməz ki, nədir baği-cinan, ya ki cəhənnəm.
Hər nə edə təqdir Xuda onda rizadır,
Çün guy o sərgəşteyi-çövkanı-qəzadır.
Xaliq edə gər bəndəni can verməyə mə'mur,
Mə'mur olar, bəndə verər canını məsrur.
Ölmək onun əmrilə həyati- əbədidir
Gər qalsa xilafətdə, məmati-əbədidir.
Hər kəs edə muzd almaq üçün Həqqə ibadət,
Müşkül ola məqbul, o növ' ilə itaət.
Cəbrili-əmin nazil olub eylədi izhar:
"Ey ərşi-hidayətdə olan mehri pürənvar!
Çün rəhmətsən cümleyi-məxluqi-cəhanə,
Əmr etdi sana xaliqi-bimislü yeganə.
Biməsləhətü məşvərət, ey sərvəri-əyyam,
Hökm eyləyirəm, eyləmə heç bir işə iqdam.
Tə'lifi-qülub eylə sən, ey mehri-hidayət!
Hürriyyət ilən xəlq edər əmrinə taət.
Cəm'iyyət ilən hər işə tədbir edərsən,
Cəm'iyyət ilən aləmi təsxir edərsən.
Hər əmrdə əshabi-üqul olsa müsəmməm,
Dünyanın ümuratı olur səhlü münəzzəm.

Hər şəxsdə bir növ' olur qüvveyi-idrak,
İdrakləri cəm' elə, ey sərvəri-lövlak!
Cəm'iyyəti-əfkardədir feyzi-səadət,
Sən eylə bina, ümmətinə ta ola adət.
Sən ümmətini qılma əsarətlə müqəyyəd,
Hürriyyəti aləmdə bina eylə, Məhəmməd.
Cəhd eylə əsarətdən ola millətin azad,
Azad olan millət edərlər sana imdad.
Hübbül-vətən imandır, ey əhli-dəqayiq,
Cananinə zövq ilə verir canını aşiq".
Azadəliyi ümmətinə verdi Peyəmbər,
Az vəqtdə təsxir elədi aləmi ləşkər.
Bürhandı onun fəthinə hər rəzmdə şəmşir,
Ta fəth elədi Məkkəni sultani-cəhangir.
Mə'zun elədi Heydəri çün ərşi-hidayət,
Bami-hərəmə çıxdı o xurşidi-vilayət.
Afaqə təcəlla elədi mehri-münəvvər,
Guya ki, yetib ərşi-müəllayə Peyəmbər.
Latü Həbəli saldı yerə bami-hərəmdən,
Çərxə ucalıb nalə səsi əhli-sənəmdən.
Çün cəhri-səda ilə dedi ismi-cəlali,
Lal eylədi naqusi onun sövti-Bilali.
Hər yanə hücum eylədi çün firqeyi-naci,
Məğlub elədi xəsmi alıb bacü xəraci.
Hökm eylədi çün sərvərü salari-zəmanə,
İranə tərəf ləşkəri-din oldu rəvanə.
Ənqayi-fələk Qafə tərəf eylədi pərvaz,
Ya şəhpər açıb fövci-qürab üstünə şəhbaz.
Çün firqeyi-ifritə yetib fövci-məlaik,
Əmr eylədi rəzm etməyə sərdari-məmalik.
Çün ümməti-islam dedi ayeyi-təkbir,
Xəsm üstə hücum eylədi ol qövmi-cəhangir.
Bir həmlədə məğlub olub ləşkəri-İran,
Seylabi-bəla məmləkəti eylədi viran.
İslami qəbul eyləmədi Xosrovi-Pərviz,
Qanın yerə cari elədi xəncəri-xunriz.
Nəzm ilə mədar eylədi çün gərdişi-əyyam,
Gəncinəni tarac elədi ləşkəri-islam.

Sərməst idilər fəthdən ol əhli-tərəblər,
Kafuri nəməklən bədəl eylirdi ərəblər.
Bilməzdi, cəvahirləri xak üstə atardı,
Xurşidi-təlanı qəməri-simə satardı.
Səbr eyləsə hər millət əgər zəhmətü rəncə,
Sındırsa tilsimi, yetişir xaneyi-gəncə.
Ey vay, o gündən yetişə sədmə vəfaqə,
Heç qəl'ə tab eləməz seyli-nifaqə.
Əhkami-xudavəndə qiyam eyləyiz, ey qövm!
Firdovsi-həmiyyətdə məqam eyləyiz, ey qövm!
Çün oldular ənsar Ühüd rəzminə mə'mur,
Əflakə açıb şəqqələrin rayəti-mənsur.
Hərçənd deyil layiq edim şərhi-müsibət,
Ayineyi-əhbabi tuta jəngi-küdurət.
Qəm yoxdu kəsuf içrə qala mehri-münəvvər,
Şəmşiri-hilali edər afaqi müsəxxər.
Məstur olub rəzmi-Ühüd də rüxi-mənzur,
Məğlub olub ləşkəri-şahənşəhi-mənsur.
Məcruh olub cəbheyi-qərrayi-Məhəmməd,
Gülrəng olub mehri-dilarayi-Məhəmməd.
Ruxsarına pəs cari olub lə'li-müzabi,
Dürcində şikəst oldu onun gövhəri-nabi.
Bərəks mədar eylədi çün gərdişi-əyyam,
Çün oldu pərakəndə o gün ləşkəri-islam.
Kühsardə mənzil elədi piri-təriqət,
Bürc içrə nihan oldu o xurşidi-həqiqət.
Çün gördülər ol sərvəri biyar və xəstə,
Küffar hücum eylədi Peyğəmbərin üstə.
Hər dəstə gələn vəqtə deyirdi şəhi-əbrar,
Qoyma gələ bu firqəni ya Heydəri-kərrar!
Əllərdə tutublar məni öldürməyə şəmşir,
Zülmati götür ərsədən, ey mehri-cəhangir.
Şəmşiri-şərərbar ilə zərğami-hünərvər,
Küffari pərişan elədi Heydərü Səfdər.
Hər dəstəyə çün həmlə edərdi Şəhi-mərdan,
Bərhəm eləyirdi o səfi zeyğəmi-qürran.
Şəmşiri şəyatini salıb bəndi-tilismə,

Pəs qoymadı yetməkliyə gəncineyi-cismə.
Qurtardı Yədullah onu hər növ’ bəladən,
Xurşidi-səfa çıxdı o zülmati-cəfadən.
Doxsan yara dəydi o şəhənşahi-zəmanə,
Tab eylədi zərğami-Xuda tiğü sinanə,
Rövzənlər açıb qəsri-vücudinə cərahət,
Pürnur edə ta aləmi xurşidi-hidayət.
Yeddi yara möhlikdi dəyən vəqtə vücudə,
Pəs qamət tab eyləmədi getdi sücudə.
Cəbril əlin tutdu olub rast qiyami,
Tul istəmədi səcdədə qalsın o imami.

*1906*

## İNFAQ

*Məsəlül-ləzinə yünfiqunə əmvaləhum fi səbilillahi kəməsəli həbbətın ənbətət səb’ə sənabilə fi külli sünbülətin miətü həbbətin-vəllahü yüza’ifü limən yəşa’ü.*[*]

İnfaqələrindən eləyim şəmmeyi-izhar,
Agah ola ta firqeyi-islami-vəfadar.
İstərdi gedə xətmi-rüsül cəngi-Təbukə,
Bu növ’ ilə əmr eylədi əshabi-sülukə.
İmdad eləyin mal ilə, əshabi-giramım,
Sizdən olacaq hasili-məqsudü məramım.
Ta dürci-dəhanın açıb ol xazini-əsrar,
Mənzum elədi riştəyə bin gövhəri-şəhvar.
Əvvəldə Əbubəkr o fərxəndə xisali,
Bəzl eylədi hər nə var idi dövlətü mali.
Cismində qalıb bircə rida ilə libasi,
Xurşidə kifayətdir o ənvari-ziyasi.
Bəs verdi Ömər dövlətinin nisfini şahə,
Məsrəf eləsin sərvəri-din fövci-sipahə.
Bin misqal Osman təla eylədi infaq,
Məsrur ola ta padşəhi-ənfüsü afaq.

---

[*] Mallarını Allah yolunda sərf edənlərin halı yeddi sünbül verən bir toxuma bənzər ki, bu sünbüllərin hər birində yüz ədəd dən vardır. Allah istədiyi şəxs üçün bunu qat-qat artırır (Bəqərə surəsi, ayə 261).

Ovf oğlu o dəm eylədi dörd min dirəm ehsan,
Dilşad ola ta padşəhi-aləmi-imkan.
Hər kəs edib əshabdən infaq kəramət,
Cəm'iyyətin infaqi edib xəlqə kifayət.
İslam olan şəxsdə qeyrət gərək olsun,
Cəm'iyyəti-xeyriyyədə himmət gərək olsun.
Sərvətlə olur cümlə ümurat münəzzəm,
Sərvətlə olur xəlq cəhan içrə müəzzəm.
Sərvətlə olur firqeyi-miskinə inayət,
Zillətdə qalan şəxslərə rəhmü ianət.
Sərvətlə olur kəsb eləmək elmü kəmali,
Elm ilə olur kəsb eləmək sərvətü mali.
Sərvətlə bina etmək olur məscidü məktəb,
Məktəbdə olur firqeyi-ətfal müəddəb.
Sərvətlə açan xəlqlərə babi-nicati,
Zülmətdə verir Xızri-dilə abi-həyatı.
Sərvətlə əlac etmək olur zarü səqimə,
Sərvətlə olur tərbiyət ətfali-yetimə.
Hər millət olur sərvət ilən aləmə dara,
Gər eyləsələr himmətü ədlilə müdara,
Cəm'iyyəti-xeyriyyədə var xəlqə fəvaid,
Hər dəmdə olur millətin əhvalına aid.
Bir cüz'i əgər himmət edə firqeyi-islam,
Öz qüvvəsi qədri eləsə məclisə ən'am.
Cəm'iyyəti-xeyriyyədə bizəhmətü birənc,
Hər ayda olur cəm,' o sənduqdə bir gənc.
Bu sirri əyan eylədi barani-bəhari,
Gər cəm' edəsən qətrələri, seyl olu cari.

*1906*

## QƏZƏL

Zəmir ayinəsindən rəf' olur jəngar sərvətlə,
Təcəllayə gəlir əksi-rüxi-dildar sərvətlə.
Bilib əhli-vəfa qütb olduğun bu dövri-axirdə,
Nizami-aləmi-imkan olur pərgar sərvətlə.
Qalanda kəştiyi-islamiyan dəryayi-heyrətdə,
Olur Nuhi-ədalət onlara qəmxar sərvətlə.

Həsari-məmləkət viran ola seyli-həvadisdən,
Edər möhkəm binayi-qəl'əni me'mar sərvətlə.
Cəhan mülkinə məğrur olma, sə'y et kəsbi-xeyr eylə,
Bəqayi-ömr fanidir, qalır asar sərvətlə.
Bu sözdən vəhşət etmə, ram olursan, ey dili-qafil,
Çəkilsə tövsəni-iqbalına timar sərvətlə.
Xəzani-fəqrdən solsa riyazi-işrəti-aləm,
Alır feyzi-təravət sahəti-gülzar sərvətlə.
Nəsimi-sübhdə gülzari-rəhmətdən əsər Qüdsi,
Yatanlar xabi-qəflətdən olur bidar sərvətlə.

*1906*

## TƏŞƏKKÜR VƏ TƏHNİYƏTNAMƏ

*"Nicat" qiraətxanəsinin baniyi-möhtərəmlərinin hüzuri-bahirənnurlərinə*

Ey cəvanani-xirədməndü vəfadari-vətən,
Çox zəmandan sizi gözlərdi diləfkari-vətən.
Neçə yüz illər edər göz yaşı ruxsarə rəvan,
Ağlayır sübhü məsa dideyi-xunbari-vətən.
Taği-gərdundə bilirsiz nədir əfvaci-nücum,
Od səpibdir fələkə ahi-şərərbari-vətən,
Qanə döndi cigəri, çeşmi tökər lə'li-müzab,
Kəhrəba tək saralıb arizi-gülnari-vətən.
Etsələr aləmə övdət əgər əcdadi-giram,
Qalmayıbdır görəcəklər dəxi asari-vətən.
Nə deyirlər bizə, axır yaza bilməm o sözü,
Dərk edər nüktəni çün firqeyi-huşyari-vətən.
Qələmü lövhə necə bir xəti təhrir eylər,
Oxunan vəqt olunar zillət ilə xar vətən.
Üləmavü hükəmalər çox idi aləmdə,
Nə üçün olmadılar dəhrdə qəmxari-vətən.
Ol zəvat aqibəti-karə nigah etmədilər,
Oldu halati-qəməfzayə giriftar vətən.
Hər tərəfdən tutub ətrafını seylabi-bəla,
Necə tab eyləyə bu sədməyə divari-vətən.
Çün həyat ilə məmatında təfavüt yoxdur,
Gördü bu haləti firdovsdə salari-vətən.

Dedi, yarəb, sən özün dadına çat bəndələrin,
Qalmadı bircə nəfər yavərü ənsari-vətən.
Eylər, əlbəttə, Xudavənd ona lütf ilə xitab,
Qoymaram xar ola zülm ilə bu gülzari-vətən.
Dövr təkmilə yetirdi neçə bin əhli-kəmal,
Hər tərəfdə görünür indi pərəstari-vətən.
Məmləkət cisminə "İrşad" ilə can verdi "Həyat",
Oldular sübhü məsa naşiri-əxbari-vətən.
"Tərcüman" dürci-gühərbarın açıb qıldı nisar,
Pürbəha oldu yenə gövhəri-şəhvari-vətən.
Seyqəli-ülfət ilən ayinələr aldi cila,
Qıldı rüxsari-dilarasını izhar vətən.
Zülməti-qəfləti məhv etməlidir cilveyi-"Nur"
Görünə ənfüsü afaqdə ənvari-vətən.
"İctihad" ilə yetər cudi-ümumi-nasə,
Qütbün ətrafına seyr eyləsə pərgari-vətən
Yoxdu bu şəhri-səfa içrə qiraətxanə,
Deyə əhbablərə dərdini dildari-vətən.
Şükrillah ki, açıldı bizə bir babi-"Nicat",
Aləmə zahir olub himməti-əsrari-vətən.
Gövhəri-elmə xiridar olanlar gəlsin
Ki, açıb gəncini sərrafi-gühərbari-vətən.
Necə gövhər ki, verir qəlblərə nurü ziya,
Bu ziya ilə olur rövnəqi-bazari-vətən.
Cilvələndi fələki-Qüdsidə xurşidi-nicat,
Qalmaya zülməti-qəflətdə həvadari-vətən.

*1906*

## FƏVAİDİ-MƏCLİSİ-CƏM'İYYƏTİ-XEYRİYYƏ

Əgər himmətlə cəm'iyyət edə göftari-xeyriyyə,
Olur məxluqə zahir hikməti-əsrari-xeyriyyə.
Bəhari-aləmara tək müəttər eylər afaqi,
Nəsimi-mişkbari-sahəti-gülzari-xeyriyyə.
Alır tabü təravət gülşəni-əfsürdeyi-aləm,
Əgər sərçeşmədən cari ola ənhari-xeyriyyə.
Fəzayi-aləmi-zülmati qəflətdən edər rövşən,
Təcəlla eyləsə xurşidi-pürənvari-xeyriyyə.

Olur eymən sipahi-ehtiyac fəqrü zillətdən,
Çəkilsə millətin ətrafına divari-xeyriyyə.
Alır aşiqlərin əldən qərarü səbrü aramın,
Əgər hüsni-cəmalın eyləsə izhar xeyriyyə.
Bəsirət əhli qıl, yarəb, gözüm mə’nayi-surətdən,
Niqabın rəf’ qılsa çöhrədən dildari-xeyriyyə.
Qəm etmə, ömr əgər fani ola bərqi-həvadisdən,
Qalır baqi cəhanda rövnəqi-asari-xeyriyyə.
“Həyat”ın lövhinə təhrir qıldı xameyi-Qüdsi,
Oxunsun əhli-halə nəzmilən əxbari-xeyriyyə.

*1906*

## XEYRİYYƏ

Əmr edibdir millətə sultani-din,
Xeyr işə iqdam edin, ey mö’minin.
Saili-məhrumi məhrum etməyin,
Bəzl etsən, xəlqə mə’lum etməyin.
Hər kəs infaq etsə iltafi-Xuda,
Yeddi yüz bir danəyə eylər əta.
İstəsə təz’if edər Rəbbi-rəhim,
Birə bin dörd yüz əta eylər kərim.
Ey səxavət əhli, nəf’i-tam edin!
Sidqi-qəlbilə ona iqdam edin.
Qorxmayın, ey firqeyi-əhli-yəqin,
Mö’təbərdir gənci-şahənşahi-din.
Eyləməz bir nöqteyi-səhvü xəta,
Ruzi-məhşərdə sizə eylər əta.
Çün bilir hər kəs ki, sahibhaldır,
Məclisi-xeyriyyə beytülmaldır.
Çünki əyyami-səxavətdir bu gün,
Ruzi-irşadü inayətdir bu gün.
Əhli-insaf eyləməz hərgiz qəbul,
Sail olsun ümməti-xətmi-rəsul.
Bu işə iqdami-cəm’iyyət gərək,
İttifaqü qeyrətü himmət gərək.

Bilməsinlər malü dövlət sahibi,
Talibani-nami-himmət sahibi.
Beş nəfər gər mülkü malından keçə,
Şövkətü şə'nü cəlalından keçə.
Bu işə hərgiz kifaf etməz yəqin,
Cəngdən mir'ati saf etməz yəqin.
Cümlə malın bəzl edə sahibkərəm,
Hər fəqirə çatmaz ondan on dirəm.
Neçə yüz milyon cəmaətdir bu qövm,
Talibi-bəzmi-səadətdir bu qövm.
Hər biri infaq qılsə bir dirəm,
Cəm' olur hər ayda bir gənci-üməm.
Dövlətü millət olur həddən ziyad,
Məmləkət mə'mur olur əhbab şad.
E'tidalından əgər dönsə məcaz,
Gənci-millət illətə eylər əlac.
Bir özün fikr eylə, ey mərdi-qəni,
Səndən əfzun istəyən kimdir səni.
Çün yetər cövri-xəzanə eyşi-bağ,
Lalə tək qəlbin olur həsrətlə dağ.
Hiç vəqt övlad yad etməz səni,
Qəbr zülmatində şad etməz səni.
Müntəzirdir mülkü mali-hazirə,
Baxmaz o hökmü vəsiyyü nazirə.
Çün sana sərvət əta eylüb xuda,
Sülsi-malü dövləti eylə cüda.
Məclisi-xeyriyyəyə təslim qıl,
Dəftəri-gəncinəyə tərqim qıl.
Ta ki əmrindən təxəllüf etməsin,
Naxələf varis təsərrüf etməsin.
Sən də varisdin, əya alicənab,
Gör atançün neylədin kari-səvab.
Çün muradın cür'əsin nuş eylədin,
Sahibi-malı fəramuş eylədin.
Etməyirsən bir məzar üstə güzar,
Ta desin halın sana sahibməzar.
Ey oğul, dərdimə dərman etmədim,
Öz əlimilə bəzlü ehsan etmədim.

Zarü nalan, didə giryanəm, oğul,
İndi, vallahi, peşimanəm, oğul.
Bağlanıbdır yüzimə babi-nicat,
Qalmışam zülmatdə heyranü mat.
Bax məni-biçarəyə ibrət eylə,
Axirətçün, ey oğul, himmət eylə.
Məhv edər zülmatını ənvari-xeyr,
Dəhrdə baqi qalır asari-xeyr.
Badeyi-qəflətdən olduq biz çü məst,
Ol səbəbdən olmadıq millətpərəst.
Bir-birilə çün bəradər olmadıq,
Qəm günündə yarü yavər olmadıq.
Öldü qardaş, oğlunu yad etmədik,
Binəva ətfali dilşad etmədik.
Dərbədər, giryanü zarü natəvan,
Əşk çeşmi-arizə oldu rəvan.
Binəva ətfal basuzü məlal,
Kuçəvü bazardə eylər sual.
Ey müsəlmanan, yetimi-dərbədər,
Eyləyin əhvalıma bircə nəzər.
Qış günü sərmayə yox tabım mənim,
Mənzilü həm yox rəxti-xabım mənim.
Bir görün üryanü zarü müztərəm,
Ey cəmaət, ümməti-Peyğəmbərəm.
Üç nəfər məzlumə baəfkarü xar,
Evdə gözlərlər məni bahali-zar.
Mən gərək kəsbi-məişət eyləyim,
Ac qalan ətfalı rahət eyləyim.
Eyləyəndə lövhə bu beyti rəqəm,
Ey cəmaət, od tutub yandı qələm.
Bir yetimi görsəniz zarü həzin,
Sahibi-himmət çəkər millət qəmin.
Gər gedib üqbayə qəmxari onun,
Xakdə mənzil edib yari onun.
Ölməyibdir firqeyi-islamiyan,
Dərbədər qalsın yetimi-natəvan.
Saxlayarlar nazü izzətlən onu,
Dindirərlər çox məhəbbətlən onu.

Rəsmdir çün sahibani-mə’rifət,
Tifli-məzlumə edərlər tərbiyət.
Tərbiyət görsə, olur sahibədəb,
Sahibi-elmü ədəb görməz təəb.
Elmilən hər dərdi-külfət dəf’ olur,
Seyqəl ilən jəngi-qəflət dəf’ olur.
Elmdir dünyanı abad eyləyən,
Elmdir məxluqi dilşad eyləyən.

*1906*

## QƏZƏL

Ey elm! Tutub aləmi-əflaki cəlalın,
Məhv eylədi zülmati o xurşid cəmalın.
Qəlb ilə qulam oldu sana Xosrovi-əyyam,
Şirindir, ey dilbəri-gülçöhrə məqalın.
Can Xızrinə hər dəmdə həyati-əbədidir,
Zülmatt-dəvatından axan abi-zülalın.
Ləbriz qılıb gövhər ilən sahili-dəhri,
Məvvac olub aləmə dəryayi-nəvalın.
Gülzari-lətayifdə qılıb adəmi məhfuz,
Əsmari-ülum ilə o fərxəndə nihalın.
Əncüm yetişir övc eləyən vəqt vəbalə,
Yoxdur sənin, ey mehri-cəhantab, zəvalın.
Bilməm nəyə təşbih eləyim nurini, ey elm!
Yoxdur, bilirəm, aləmi-surətdə misalın.
Hər ayda işarə eləyir ərşi-kəmalə,
Övci-fələki-Qüdsidə əbruyi-hilalın.

*1906*

## MÖVLUDİ-NƏBİ

Ümidim vardır əltafi-rəhimə,

Rə'ufü qadirü həyyü qədimə.
İnayətdən bizi məhrum qılmaz,
Gədayıq, gəlmişik babi-kərimə.

Yetişdi şükr ola əyyami-məs'ud,
Nəsimi-gülşəni-gülzari-məqsud.
Müəttər qıldı afaqi-cəhani,
Səid olsun sizə bu eydi-mövlud.

Gəlir vəhy ilə hərdəm ney nəvayə,
Degil nitqi onun hərgiz həvayə,
Neyi-vəhdət həqiqət Müstəfadır,
Salıb şurü nəvani masivayə.

Olur çün mehri-ayatın zühuri,
Edir pürnur mir'ati-büluri,
Bəsirət əhlini məsrur eylər,
Vəli dərk eyləməz xəffaş nuri.

*1906*

## MÖVLUDİ-NƏBİ QƏSİDƏSİ

Ey güruhi-mö'minin, sübhi-səadətdir bu gün,
Eydi-mövludi-şəhi-xətmi-risalətdir bu gün.
Əndəlibani-xoşəlhani-riyazi-mərifət,
Növbəhari-aləmarayi-həqiqətdir bu gün.
Çeşməsari-mərhəmətdən cari oldu cuybar,
Çün qiyami-xoşxurami-sərvi-qamətdir bu gün.
Sahəti-gülzardən əsdi nəsimi-mişkbar,
Xabdən bidar olun, yövmi-inayətdir bu gün.
Xızrican zülmətdə tapdı mənbə'i-abi-həyat,
Ruzigari-feyzi-irşadü hidayətdir bu gün.
Çün məlaiklər qurub bəzmi-fələkdə inbisat,
Aləmi-baladə şuri-eyşi-işrətdir bu gün.
Eylədi afaqi rövşən afitabi-ərşi-din,
Hər yana baxsoz, görərsüz rəf'i-zülmətdir bu gün.
Qoydu bir qanun aləmdə o şahi-ruzgar
Cümlə əhkami onun eyni-ədalətdir bu gün,
Gər itaət eyləsək əmrinə olmaz ixtilaf,

Çünki, Qur’ani-Mübin islamə hüccətdir bu gün.
İttihadə milləti çün sə’y edir sübhü məsa,
Sidqilən sultani-dinə hər kəs ümmətdir bu gün.
Himmətü ülfət bu əyyami-cəhanaşubdə,
Şəhpəri-şəhbaz övci-çərxi-nüsrətdir bu gün.
Eyləyir tədbir, cəmiyyət pərişan olmasın,
Çünki, əyyami-müvasatü müvəddətdir bu gün.
Kibrü büğzü kinəvü kizbü ədavətdən keçüz,
Mehriban qardaşlar, əyyami-sədaqətdir bu gün.
Eyləsöz əqvalü əf’alinə ə’danın nəzər,
Hər biri əsrari-pünhanə əlamətdir bu gün.
Sürmeyi-elmilə pürnur olsa əbsari-qülub,
Dideyi-ibrətlə baxsoz, qeyri-halətdir bu gün.
Qoymayın şuri-müxalifdən xərab olsun həsar,
Çari-canibdən gələn seylabi-afətdir bu gün.
Məmləkət abad olur, əhbablər xəndani-şad,
Mülki mə'mur eyləyən elmilə xidmətdir bu gün.
Elm surindən alıb əmvatlər feyzi-həyat,
Məhşəri-süğravü qovğayi-qiyamətdir bu gün.
Məhfili-xeyriyyəyə imdad qılmaq fərzdir,
Ruzgari-qeyrətü dövrani-himmətdir bu gün.
Ta açaq əbnayi-millətçün müəllimxanələr,
Ey cəmaət, eyni-əyyami-səxavətdir bu gün.
Dini-paki-Müstəfa aləmdə buldu intişar,
Həft iqlimi tutan ənvari-vəhdətdir bu gün.
İngiliz mülkündə bir şeyxi-hidayətkarə bax,*
Mərdi-aqil kaşifi-əsrari-hikmətdir bu gün.
Göstərir fövci-nücumə övci-izzətdə hilal,
Rəhnümayi-firqeyi-əhli-təriqətdir bu gün.
Ey hidayət afitabı, zülməti məhv eylədin,
Xəlqi də’vət eyləmək eyni-ibadətdir bu gün.
Əksəri-məxluqlər bimardır, istər şəfa,
Ey Fülatuni-zəman, yövmi-təbabətdir bu gün.
Ərşi-ə'layə deyirlər firqeyi-Qüddusiyan,
Feyz verməkçün kəmal əhlinə adətdir bu gün.

*1906*

---

* Nyürpolda Abdullah Vilyam həzrətlərinə işarədir (Ə.M.)

## MÖVLUD MƏCLİSİNƏ DAİR MƏNZUMƏDİR

*Neçə nəfər ərbabi-himmət müsəlmanların hüsni-ehtimamları ilə Bakıda iqamət edən Ümumqafqaziya və Dağıstan müsəlmanlarının ittifaq və hüsni-ittihadilə Bakıda mövludi-Nəbi edilməsi.*

Götürdi cövri-xəzani bəhari-himmətü ülfət,
Dübarə buldu səfa laləzari-himmətü ülfət.
Nəsimi-rəhməti-Həqq əsdi çün şəbistanə
Ki, açdı qönçələrin şaxsari-himmətü ülfət.
Qərarü taqətini aldı aşiqi-zarın,
Əyan qıldı yüzin gülüzari-himmətü ülfət.
Süfufi-ləşkəri-zülmati eylədi pamal,
Rikabə basdı qədəm şəhsüvari-himmətü ülfət.
Müxalif eyləyə bilməz dübarə şəhraşub,
Çəkildi kişvəri-dinə həsari-himmətü ülfət.
Xərab məmləkəti tazədən edər mə’mur
Ki, hər diyarə düşər çün güzari-himmətü ülfət.
Əziyyəti-dili-mö’mininü müslimin olmaz,
Olur behişti-dilara diyari-himmətü ülfət.
Fərazi-çərxdə əxtərlərə hilalasa,
Həmişə cilvələnir zülfüqari-himmətü ülfət.
Cəhanda qübbeyi-islami möhkəm etmək üçün
Çəhar rükndülər çaryari-himmətü ülfət.
Salırdi zəlzələ ərkani -ainatə təmam,
Bu qədr vardı səbatü qərari-hümmətü ülfət.
Həzar şükr Xüdavəndigari-rəhmanə,
Yetişdi imdi bizə ruzigari-himmətü ülfət.
Açıldı şəhpəri-şəhbazi-asimani-cəlal,
Görək nə qism olacaqdır şikari-himmətü ülfət.
Əgərçi can verir afaqə eydi-novruzi,
Tutar əziz onu tacidari-himmətü ülfət.
Gərək əzz tutaq biz bu eydi-mövludi,
Bununla çünki olur paydar himmətü ülfət.
Bu əmri-xeyrə sürur ilə eylədik iqdam,
Qalar zəmanədə ta yadigar himmətü ülfət.

Cənab Əhmədü Məhmud oldu xürrəmü şad
Ki, etdilər ona gövhər nisar himmətü ülfət.
Bu eyd gülşəni-Qudsini eylədi xürrəm
Ki, oldu cari ona cüybari-himmətü ülfət.

*1906*

## MÖVLUDİ-NƏBİ

Eydi-mövludi-Nəbi oldu qərin,
Oldular məsrur qövmi-müttəqin.
Qıldılar tə'yin bir aliməqam,
Ta yığılsun ümməti-xeyrül-ənam.
Mehri-millətpərvəri-ruyi-zəmin,
Sədri-məclis Hacı Zeynəlabidin.
Hökm qıldı, məhfili rəngin edin,
Hər otağın fərşini səngin edin.
Eyləyin tərtibi ülfət məclisi,
Behcətü eyşü məsərrət məclisi.
Eydi-mövludi-səadətdir bu gün,
Sübhi-əyyami-inayətdir bu gün.
Layiqi-sultani-din olsun gərək,
Rövzeyi-xüldi-bərin olsun gərək.
Məclis olsun misli-firdövsi-bərin,
Qəsri-cənnətdə otursun müslimin.
Aləmi-baladə rəngindir fələk,
Şadü xəndan əyləşib fövci-mələk.
Ey müsəlmanan, qurun bəzmi-nişat,
Eyləyin eyşü sürurü inbisat.
Mülki-Qafqazdan beizzü ehtiram,
Gəldilər çox müftiyati-xoşkəlam.
Məhfilə cəm' oldular əhli-ülum,
Çərxi rövşən qıldı mehr ilə nücum.
Rəhnümayi-müslimin Hacı Məcid,
Ömrini pərvərdigar etsin məzid.
Ey vəhidi-əsrü danayi-zəmən,
Pişvayi-din mövlanə Həsən.

Afitabi-ərş gərçi durdür,
Leyk mehrindən cəhan pürnurdür.
Gəldilər bin beş yüz əbnayi-vətən,
Doldu əncümlən sipehri-əncümən.
İki yüz əlli nəfər şagirdlər,
Şövqlən baği-səfayə gəldilər.
Oldu rəngin məclisi-eyşü sürur,
Mövcə gəldi şur ilən dəryayi-nur.
Aləmi-mə'nadə, ey əhli-zəmən,
Nurbaran oldu səhni-əncümən.
Bu sözü Məcnuni-vəhdətdən soruş,
Sirri Leylayi-səbahətdən soruş.
Ta bəyan etsin nədir hüsnü cəmal,
Xosrovi məsrur edər Şirin məqal.
Verdilər məxluqə şərbətlə təam,
Ta yetişdi növbəti-xətmi-kəlam.
Əvvəla, əhli-şükuh Molla Kərim
Çıxdı övci-minbərə mərdi-səlim.
Eydi-mövludə münasib bir kəlam
Oxudu sövt ilə, ta oldu təmam,
Xızr əfəndi sonra təqrir eylədi,
Nitqi-paki xəlqə tə’sir eylədi.
Rəf’ qıldı zülməti mehri-nicat,
Verdi xəlqə və’zilən Abi-həyat.
Molla Musa ilə pəs molla Kərim
Oldular Turi-səfa üstə müqim.
Fövqi-minbərdə həmavaz oldular,
Əhli-halə kaşifi-raz oldular.
Tutiyani-gülşəni-şahi-zəmən,
Oldular gülzardə şəkkərşikən.
Aşiqi-rüxsari-xurşidi-vəla,
Bülbüli-gülzari-din Ağabala.
Cilvələnsin əxtəri-bürci-sə’id,
Lütfi-Həq olsun ona daim məzid.
Pəs Məhəmməd bəy cənabi-möhtərəm,
Afitabi-rövşəni-bəzmi-üməm
Xoşnəva bülbüllərə verdi nizam,
Məhfili-işrətdə bazövqi-təmam.

Çəkdilər şagirdlər məclisdə səf,
Əndəlibani-gülüstani-şərəf.
Durdular nəzmilə musiqar tək,
Ərğənunun səfhəsində tar tək.
Dəydi çün tənburə mizrabi-həva,
Çar tari-ünsüri qıldı səda,
Məhfili-izzətdə dəmsaz oldular,
Bir həva ilə həmavaz oldular.
Aləmi məsrur qıldı ol nəva,
Şur ilən doldu təmamən masiva.
Seyqəli-sövt ilə ərbabi-vəla
Verdilər ayineyi-qəlbə cila.
Babi-işrət sövtlən məftuhdur,
Ləhni-xoş çünki qəzayi-ruhdur.
Dedilər çün nuri-sərməd ismini,
Afitabi-din Məhəmməd ismini.
Yetdi övci-ərşə sələvatın səsi,
Tutdu fövqi-taği-çərxi-ətləsi.
Məhfili görsəydi hər nikusirişt,
Dərk edərdi ki, nədir baği-behişt.
Dilnişini-cənnətdir işrət məclisi,
Ülfətü mehrü müvəddət məclisi.
Qaziyi-Bakuyə salari-əlim,
Çıxdı ərşi-minbərə mehri-əzim.
Gövhəri-dürci-şəhənşahi-ərəb,
Hadiyi-din, seyyidi-alinəsəb.
Açdı dürci-nitqi-gövhərbarını,
Zahir etdi gövhəri-əsrarını.
Əvvəlinci bürcdür bürci-Həməl,
Orda xurşudi-izhari-əməl.
Çün gəlir fəsli-bəhari-imtəhan,
Aləmə zahir olur sirri-nihan.
Şurəzarın hasili çün xar olur,
Pak olan bir gülşənü gülzar olur.
Bu rəbi’ül-əvvəli-gülzari-həq,
Növbəhari-gülşəni-əsrari-həq.
Çün qədəm basdı cəhanə afitab,
Aləmi-nasutə saldı inqilab.

Zövqilən nayi-həqiqət çaldı sur,
Məhşərə cəm’ oldular əhli-qübur.
Çün Sirati-mə'nəvidir Müstəfa,
Aləmi-surətdə mizani-vəfa.
Xazini-əsrari-hikmətdir özü,
Qəlb üçün me'yari-vəhdətdir sözü.
Qütbi-əmrilə edər hər kəs mədar,
İnhiraf etməz yəqin pərgarvar.
Zahirən mehri-hidayətdir özü,
Batinən eyni-qiyamətdir sözü.
Eylədi təklifini sultani-din,
Oldular tabe' güruhi-mö’minin.
Getdi baği-cənnətə əhli-səvab,
Düşdü qə’ri-duzəxə qövmi-əzab.
Əhli-imanda olur mehrü vəfa,
Eyləməz bir zərrə məxluqə cəfa.
Cəhldir dünyanı bərbad eyləyən,
Elmdir hər mülki abad eyləyən.
Bin nəsihət qafilə verməz səmər,
Bir müsibət görsə, tez eylər əsər.
Getdi əyyamı-cəhalət, şükr ola,
Gəldi dövrani-hidayət, şükr ola.
Olmasa mərsus bünyadü dad,
Aləmi viran edər seyli-fəsad.
Ey müsəlmanan, həmiyyət vəqtidir,
Mehrü insafü müvəddət vəqtidir.
Kəlmeyi-tövhidə iqrar etmişik,
Eyni-küfrü şirki inkar etmişik.
Din ilə imanımız birdir bizim,
Kə'bəvü Qur’anımız birdir bizim.
Əhli-din islam üçün eylər kəfaf,
İxtilafı-qövmi tutmuşlar mü’af.
Sonra Əhməd bəy o xurşidi-kəmal,
Xosrovi-elm eylədi şirinməqal.
Mənbərin üstündə təqrir eylədi,
Ərşi-qəlbi-xəlqi tənvir eylədi.
Ey cəmaət, çünki fəxri-kainat,
Bizlərə zülmatdən verdi nicat.

Əhmədü Məhmudü xətmül-mürsəlin,
Eylədi qardaş bizi, ey müslimin.
Xahişi-nəfsi-şəriri-nabkar,
Töksə gər mir’ati-qəlb üstə qübar.
Seyqəli-ülfət edər jəngarı pak,
Məhv edər zülmati mehri-tabnak.
Çün olur əfsürdə səhni-laləzar,
Qəlb gülzarinə ülfətdir bəhar.
İndi lazımdır bizə himmət edək,
Elmilən bu millətə xidmət edək.
Talibi-ənvari-xurşidi-yəqin,
Xadimi-din Hacı Zeynəlabidin
Qaməti-sərvi-səhi qıldı qiyam,
Dövrəsini tutdu cümlə xasü am.
Elmi-mətbu' ilə ol sahibhünər,
Böylə isar eylədi dürrü gühər:
Siz bilirsiz, tərki-himmət etmədim,
Leyk dilxahimcə xidmət etmədim.
Elmü hikmətdən xəlayiq durdür,
Ol səbəbdən əksəri rəncurdür.
Eylədi məqsudimi Xaliq rəva,
Ömr olsa, eylərəm dərdə dəva.
Qoymayın millət ola xarü zəlil,
Bu işə razı degil Rəbbi-cəlil.
Qəlbi-paki-Müstəfani şad edək,
Milləti hər qeyddən azad edək.
Olsa gər rükni-müvəddət üstüvar,
Şad olar ərvahi-paki-çaryar.
Millətin cisminə yetmişdi məmat,
Verdi can məxluqə “İrşad”ü “Həyat”.
Cəhlü qəflət məzhəri-hər fövtdür,
Aləmi-mə’na eyni-mövtdür.
Elmilən pürnur olur ruyi-zəmin,
Alimü fazil çəkər millət qəmin.
Gərdişi-əflakü dövri-ruzigar,
Çün nihan əsrari etdi aşikar.
Çeşmi-ibrətlən əgər qılsoz nəzər,
Sizlərə zahir olur rahi-xətər.

Aləmi mə’mur edər, məxluqi şad,
İttihadü ittihadü ittihad.
Minbərə çıxdı Nərimani-zəman,
Bir gözəl nitq eylədi sahibbəyan.
Çox fəsahətlən o dəm alicənab,
Cəm'i məxluqə belə qıldı xitab:
Alərnə mə’lumdur əhli-zəmən,
Can ilən baqi olur mülki-bədən.
Məmləkət bir cismdir, can ittihad,
İttihad ilə olur mə’murü şad.
Cəhd edək bu cism bican olmasın,
Məmləkət cəhlilə viran olmasın.
Sonra təqrir eylədi Əbdülqədir,
Seyqəli-ayineyi-əhli-zəmir.
Xameyi-təqririlən mərdi-giram,
Çəkdi nəqşi-kürreyi-ərzi təmam.
Vardı hər yerdə təriqi-pürxətər,
Qıldı zahir millətə sahibhünər.
Xətm oldu burda təqriri-kəlam,
Cami-işrətdə müdam olsun müdam.
Hicridən keçmişdi, ey nikuxisal,
Min üç yüz həm iyirmi dörd sal.
Qalsın aləmdə bu xeyr iş yadigar,
Paydar etsin onu pərvərdigar.

*1906*

## QƏZƏL

Yarəb, binayi-xeyri özün paydar elə!
Ta var fələkdə şəmsü qəmər, bərqərar elə!
Qoyma riyazi-dinə yetə sədmeyi-xəzan,
Dövrani-ruzigardə fəslin bəhar elə.
Açmış fəzadə zağü zəğən şəhpəri-cəlal,
Şəhbazi-çərxi-nüsrəti nəsrinnigar elə.
Övci-səmadə cilvələnir şəqqeyi-hilal,
Fövci-nücumə nurini xurşidvar elə.
Rəhmət nəsimi eylədi bidar aləmi,
Yarəb, bizi həmişə özün huşyar elə.

Jəngari-cəhli seyqəli-elmilə rəf’ edib,
Mir’ati-Qüdsi qabili-əksi-nigar elə.

*1906*

## YA KAŞİFÜL-ƏSRAR!

*Nazimi-qanuni-elmü ədəb, sərvəri-alinəsəb, şəhsuvari-mülki-ərəb Əli ibn Əbu Talib əleyhissəlam buyurmuşdular:*

Və ə’cəb, və ə’cəb,
Beynəl-cəmadi vər-rəcəb.*

*Çün təşkili-darüş-şurayi-giramiyi-milliyi-İranın iftitahı qərarı ona müsadif olmağa binaən bu tərcibəndin inşasına iqdam olundu. Qare'ini-kiramın qəlbləri məsrur və didələri pürnur olsun.*

Afitabi-ərşi-din, xeyrülbəşər,
Verdi bu xurşidi-rəhmətdən xəbər.
Şükrilillah keçdi dövrani-qəza,
Oldu zahir aləmə hökmi-qədər.
İttisali-neyyireyin oldu zühur,
Qıldılar xəlqə səadətlə xəbər.
İttihadi-elmilən əhli-vəfa
Dərdilər nəxli-inayətdən səmər.
Çeşmeyi-həq cari qıldı cuybar,
Söndü suzi-şö’leyi-nari-şərər.
Ta ki, bin üç yüz iyirmi dörddə,
Əmri-sultani-hüda qıldı əsər.
Tapdı rövnəq din Müzəffər şahdən,
Şəqqə açdı rayəti-fəthü zəfər.
Məclisi-şurayi-millət ərşdir,
Oldular cəm’ əncümü şəmsü qəmər.

Çün demişdi şiri-Həq əmri-əcəb,
Olacaq beynəl-cəmadi vər-rəcəb.

Aləmi xurşidi-pürnur eylədi,
Zülməti afaqdən dur eylədi.

---

* Cəmadiyəs-sani və rəcəb ayı arasında təəccüblü bir hadisə baş verəcək.

Mülki-İranı o me’mari-əzəl,
Tazədən nəzm ilə mə’mur eylədi.
Çün Müzəffər oldu elm ilə əqul,
Nasiri-din xəlqi mənsur eylədi.
Lütfi-Həq məzlumi irşad etməyə,
Fazilani-əsri mə’mur eylədi.
Firqeyi-islami sidqi-qəlbilən,
Ne’məti-üzmayə məşkur eylədi.
Verdi saqi aşiqə lə’li-müzab,
Məhrəmani-bəzmi məxmur eylədi.
Oldular ümmət fədasi şövqlən,
Məhzəri zəxmilə məmhur eylədi.
Qan ilə kilki-sinan bu beytimi,
Sinəmin lövhündə məstur eylədi.

Çün demişdi şiri-Həq əmri-əcəb,
Olacaq beynəl-cəmadi vər-rəcəb.

İstədim lövhə edim hali rəqəm,
Şö’leyi-ahimdən od tutdu qələm.
Milləti tutmuşdi istibdad ilən,
Hər tərəfdən ləşkəri-cövrü sitəm.
Ləşkəri-səbrü təhəmmül qalmadı,
Mövczən olmuşdu dəryayi-ələm.
Zülmilə ta şəhpərin açdı üqab,
Gəldilər əfğanə mürğani-hərəm.
Hatifi-qeybi şəhə qıldı xitab,
Pasibansan xəlqə, ey şahi-üməm.
Olma qafil hadisati-çərxdən,
Çox vücudi zəhri-zülm etdi ədəm.
Xəlqi azad eylə, ta abad ola
Məmləkət, ey Xosrovi-əncümhəşəm.
Millətə verdi həyati-cavidan,
Varisi-taci-Kəyanü təxti-Cəm.

Çün demişdi şiri-Həq əmri-əcəb,
Olacaq beynəl-cəmadi vər-rəcəb.

Vəsvəsə eylərdi şeytanür-rəcim,
İstəyirdi lütf edə şahi-rəhim.
Yandırdı xəlqi hər sübhü məsa,
İltihabi-şö'leyi-nari-cəhim.
Sailin məqsudin eylərdi rəva,
Gər xəbər tutsaydı sultani-kərim.
Qalmaz avarə diyari-cəhldə,
Elmdir aləmdə rahi-müstəqim.
Etsə gər fikr ilə təşxisi-mərəz,
Rəf' edər hər illəti mərdi-həkim.
Olsa hər iqlimdə azadəlik,
Tazədən mə'mur olur mülki-qədim.
Yaxşı qanundur müsavat ilə ədl,
Bu nizamilə olur dövlət müqim.
Himməti-cəm'iyyətə tab eyləməz,
Kuhi-Qafi xəl' edər əzmi-rəmim.

Çün demişdi şiri-Həq əmri-əcəb,
Olacaq beynəl-cəmadi vər-rəcəb.

Oldu rəngin sahəti-bəzmi-vüsal,
Rəf' oldu möhnəti-hicrü məlal.
Lütf ilən asudə qıldın milləti,
Yavərin olsun Xudayi-zülcəlal.
Cari etdin çeşmə sari-ədldən,
Gülşəni-əfsürdəyə abi-zülal.
Cilvələndin afitabi-ərş tək.
Ləşkəri-zülmati qıldın paymal,
Dəmbədəm övci-cəlalə seyr edər,
Olmaz aləmdə bu xurşidə zəval.
Ey Müzəffər şah, fövci-millətin.
Şirdir, əldə tutub tiği-hilal.
Oldu bərpa çunki millət məclisi,
Olgilən asudə, ey sahibkəmal.
İmdi şahənşahi-aləm olmusan,
Çox yaşa, ey Xosrovi-Şirinməqal.

Çün demişdi şiri-Həq əmri-əcəb,
Olacaq beynəl-cəmadi vər-rəcəb.

Saqiya, tök sağərə lə‘li-müzab,
Ver bana, nuş eyləyim yaquti-nab.
Əsdi gülzarə nəsimi-nobəhar,
Xabdən bidar olubdur şeyxü şab.
Aşiqi-qəmgini dilşad eylədi,
Saldı hürriyyət camalından niqab.
Cilvələndi Şərqdə mehri-münir,
Aləmi-zərratə düşdü inqilab.
Əzmi-tə‘mir eylədi me‘mari-ədl,
Zülm seyli bürcü qılmışdı xərab.
Kim güman eylibdü olsun payimal,
Qəl‘eyi-müstəhkəmi-cövrü əzab.
Şahbazi-nüsrət açdı pərü bal,
Məhv oldu övcdən fövci-qürab.
Oldu qanuni-əsasi bərqərar,
Qüdsiyani-millət oldu feyzyab.

Çün demişdi şiri-Həq əmri-əcəb,
Olacaq beynəl-cəmadi vər-rəcəb.

*1906*

## YA KAŞİFÜL-ÜLUM!

*Sədri-məclisi-Nəşri-Məarif tərəfindən iftitah olunan müəllimxanələrə qanuni-tədrisi-cədidəyə mahir olmaqdan ötəri ictima edən müəllimlərə xitabdır.*

Ey xudavəndi-əlimü zülcəlal,
Qadirü həyyü qədimü layəzal.
Cilvələndi aləmə xurşidi-zat,
Oldu xətmül-ənbiya nuri-sifat.
Aləmi-icadi pürnur eylədi,
Zülməti afaqdan dur eylədi.
Seyqəli-şəmşir ilən nuri-Xuda,

Jəngi-küfri dindən qıldı cüda.
Zülmət olmazdı cəhanda müncəli,
Olmasaydı afitabi-din Əli.
Tutdular ta çərxi-himmətdə qərar,
Mahi-əncüm tək o əshabi-kibar.
Məşvərətlən əmrə tədbir etdilər,
Aləmi elm ilə təsxir etdilər.
Cilvələndi övcdə şəmşiri-bərq,
Xirələndi çeşmi-əhli-Qərbü Şərq.
Tutdu övci-taği-çərxi-ətləsi,
Rayəti-tövhidü təkbirin səsi.
Bilmirəm, qüvvət neçün oldu zəif,
Düşdü dami-zillətə qövmi-şərif.
Mülkü malü istirahət qalmadı,
Qüvvətü səbr ilə taqət qalmadı.
Həmdülillah, indi əşrafi-kiram
Qıldılar nəşri-məarifçün qiyam.
Ey müəllimlər, həmiyyət vəqtidir,
Elm ilə ehyayi-millət vəqtidir.
Sə‘y edin, xurşidi-elm etsin zühur,
Kişvəri-islami qılsın həyyi-nur.
Müddəti-tə’lim üçün vəqti-mədid,
Qoymadı qalsın bu üslubi-cədid.
Qətrə gər olsa sədəf içrə müqim,
Bəhri-elm eylər onu dürri-yetim.
Millətin mətlubi tez hasil olur,
Kə’beyi-məqsudinə vasil olur.
Elm olsa, dəf’ olur cəhli-nifaq,
Eyləyərlər xəlqi-aləm ittifaq.
İttifaq ilə cəhan mə’mur olur,
Mülk mə’mur olsa, zillət dur olur.
Sədd lazımdır ədu yə’cucinə,
Salmasın ta rəxnə dinin föвcinə.
Ərz edim əhbabə sirri-mə’nəvi,
Barmaq olsa beş, olur pəncə qəvi.
Dördü vardır, bir də olsa cə’fəri,

Millətin əfzun olur zibü fəri.
Mehriban qardaş tək ülfət eyləyək,
Sidq qəlbilə müvəddət eyləyək.
İttihadilə qılaq dəf'i-fəsad,
Eyləyək ruhi-rəsuli-Həqqi şad.
Rəhməti-Yəzdan təmam olsun bizə,
Gülşəni-Qüdsi məqam olsun bizə.

*1907*

## MƏNZUMEYİ-EYDİYYƏ

### Bəhariyyati-mə'nəvi və suri

*Qare'ini-giramın hüzuruna bir vərəqdir. Nəzəri-ərbabi-mə'rifətdə kaşifi-əsrari-Həqdir.*

Əhli-islamə mübarək ola bu eydi-səadət,
Gəldi bürci-Həmələ mehri-cəhantabi-ədalət,
Edə afaqə inayət.

Çünki məxfiydi üqul əhlinə mahiyyəti-zati,
Aləmin ayinəsin rövşən edib nuri-sifati.
Xəlq edib zülməti dəf' etməyə xurşidi-nicati,
Ədldir məhkəmeyi-ədldə qanuni-rəyasət.
Bilir ərbabi-fərasət.

Gərçi zahirdə deyil xəlqə əyan sirri-nihani,
Leyk batində tutub zikr səsi mülki-cəhani.
Hər gülü bərgü nəbatat açıb həmdə zəbani,
Eyləyir kəlmeyi-tövhidinə iqrari-şəhadət.
Ona layiqdü ibadət.

Oldu qanuni-müsavat ilə bir çünki şəbü ruz,
Kargahi-çəməni zivər edib fəsli-diləfruz,
Nəqşibəndani-təbayi' toxudu ətləsi-gülduz,
Verdi sultani-dilarayi-bəhar aləmə xəl'ət,
Eylədi cudü səxavət.

Qələmi-qüdrətdən bir xətdir türreyi-sünbül,
Mə'niyi-ayineyi-surətdir hər vərəqi-gül,
Cilveyi-arizi-didari görər dideyi-bülbül,

Hanı Məcnun, görə bir anda Leylayi-səbahət,
Məhi-tabani-məlahət.

Eyni-əltafi-Xuda bəndələri qıldı müvəffəq,
Əqli-bürhanı bəhar oldu, verə aləmə rövnəq,
Gülşəni eyləməz əfsürdə dəxi bid'əti-mütləq,
Dəf'i-zülmat elədi pərtövi-xurşidi-hidayət.
Edər afaqə inayət.

**ƏFRAD**

Cəhani eylədi icad çünki Rəbbi-qədir,
Buyurdu, seyr eləsin afitabi-aləmgir.
Bu gündə məşriqdən şəms aşikar oldu,
Təmam ənfisü afaqdə nəhar oldu.
Təcəlliyati-zühurilə afitabi-nicat
Ki, verdi gülşəni-gülzari-kainatə həyat.
Ziyasi aləmi-icadi eylədi rövşən,
Həvasi səhni-dilaranı eylədi gülşən.
Sizə mübarək ola, ey güruhi-əhli-kəmal,
Bu gün bu eydi-sə'idi-fərruxfal.

## ƏL-BAQİYİ-SÜRUD

Şamil oldu bizim əhvalımıza rəhməti-bari,
Çeşmeyi-qüdrətdən abi-zülal eylədi cari,
Verdi İsa kibi mürdələrə badi-bəhari,
Sahəti-gülşəni-əfsürdə alıb zövqü təravət
Ki, olur güldə lətafət.
Mehrin izhar elədi aləmə çün neyyiri-ə'zəm,
Nobəhar eyləyəcək dəhri-xəzandidəni xürrəm,
Olur afaqdə hər növ' ümurat münəzzəm,
Tərk olur cövrü cəfa, xəlq olur aləmdə səlamət.
Gəlir əyyami-fərağət.
Əndəlibani-çəmən oldu tüyurun vükəlasi,
Məclisi-milləti-gülzari tutub şurü nəvasi,
İstəyir möhkəm ola dəhrdə qanuni-əsasi,
Nuri-elm ilə olur məhv bu zülmati-cəhalət.
Olur ədlilə siyasət.

Əndəlibani-çəmən eylədilər hüsn ilə təqrir,
Sizə zülm etdi xəzan, dadə yetiş şahi-cəhangir,
Xətti-reyhani ilən kilki-qəza eylədi təhrir,
Etməsin zağü zəğən sahəti-gülşəndə iqamət.
Olara yoxdu ləyaqət.
Gavə tək eyləmədi tabü təvan cövrü-məlalə,
Açdı nüsrəti-elmin ərseyi-gülzardə lalə,
Qəlbinin dağını izhar elədi əhli-kəmalə,
Dedi, ey qövm, mənim dərdimə yox həddü nəhayət,
Edin imdad, cəmaət.
Ləşkəri-cövri-xəzan çünki gətirdi məni təngə,
Sahibi-qeyrət olan tab eləməz zilləti-nəngə,
Ey cəvanani-çəmən, əzm eləyin ərseyi-cəngə,
Qorxmayın firqeyi-bidaddən, ey qövmi-rəşadət,
Edin izhari-şücaət.

## ƏFRAD

Görərsiz aləmi-surətdə, ey güruhi-səfa,
Xərab eyləsə gülzarı gər xəzani-cəfa.
Gəlir bəhari-inayəti-riyaz olur xürrəm,
Nizami-ləşkəri-cövri-xəzan olur bərhəm.
Eyni bu qismdir aləmdə seyri-leylü nəhar,
Gəhi xəzan olur aləmdə, gah fəsli-bəhar.
Əgər ki, bərqi-cəfa gülşəni edər bərbad,
Bəhari-sübhi-səadət edər onu abad.
Livayi-fəth açar sərvi-naz gülşəndə,
Yetər muradə olur sərfəraz gülşəndə.

## ƏL-BAQİYİ-SÜRUD

Hazirü nazirdir aləmi-icaddə sübhan,
Basirü nasirdir dərdlərə qadirü yəzdan,
Mur üçün mülki-Süleymani edər bərhəmü viran,
Nəyə lazımdır ona xəlq eləsin ərzi-şikayət.
Edər, əlbəttə, riayət.

Səhni-gülşəndə deyir şurü nəva ilə həzarə,
Gülşəni-Qüdsiyə diqqətlə qıla hər ki nəzarə,
Olur agah yəqin hikməti-əsrari-nigarə,
Bərgi-gül üstə yazıb hikmətini xameyi-qüdrət.
Oxusun əhli-bəsirət.

*1907*

## MƏNZUMEYİ-EYDİ-MÖVLUD

Oldu məşriqdən əyan mehri-pürənvari-Mühəmməd,
Qıldı məsruri-vəfa milləti didari-Mühəmməd,
Güli-ruxsari-Mühəmməd.
Çün ədalətlə müsavidir onun leylü nəhari,
Oldu gülzari-səfanın bu gün aləmdə bəhari,
Çeşmeyi-rəhməti-Həq abi-zülal eylədi cari,
Olmaz aləmdə xəzan gülşəni-gülzari-Mühəmməd,
Güli-ruxsari-Mühəmməd.
Qıldı çün bəndələrə lütf Xudavəndi-yeganə,
İstədi agəh ola xəlq bu əsrari-nihanə,
Eylədi nazil o öz rəhmətini mülki-cəhanə,
Qütbi-tövhid ilə seyr eylədi pərgari-Mühəmməd,
Güli-rüxsari-Mühəmməd
Çünki məstur idi xurşidi-cəhantabi-ədalət,
Təl'əti-küfrdə qalmışdılar ərbabi-zəlalət,
Məst qılmışdı cəhan əhlini səhbayi-cəhalət,
Xabi-qəflətdən edib aləmi bidar Mühəmməd,
Güli-rüxsari-Mühəmməd.

## ƏFRAD

Bu gün təcəlliyi-Həq Şərqdən zühur etdi
Ki, məhvi-zülmət edib, dəhri eyni-nur etdi.
Gətirdi seyqəli-rəhmət qılıb jəngarın,
Süfufi-aşiqə göstərdi mehri-dildarın.
Dəmadəm eylədi göftari nuri-həqqi məzid,
Deyildi sidqi-iradətlə kəlmeyi-tövhid.

Qutardı bəndələri qeydi-şirki-qəflətdən,
Müşərrəf eylədi İslamə eyni-vəhdətdən.
Təmami-millləti qardaş edib Rəsuli-kiram,
Odur ki, ərz edirəm, ey cəmaəti-islam!
Ədavəti götürün ülfətü müvəddət ilən,
Rəsuli şad eləyin ittihadi-millət ilən.

## ƏL-BAQİYİ-MOİZƏ

Əmr edib millətini ülfətə sultani-hidayət,
Çün müvəddətlə olur firqeyi-islamdə qüvvət,
Qalmaz ayineyi-qəlbində onun jəngi-ədavət,
Qılsa hər şəxs əgər qəlb ilə iqrari-Mühəmməd,
Güli-rüxsari-Mühəmməd.

İttihad ilə edib qəl'əni möhkəm şəhi-iman,
Rəxnə salmaz ona hər qədr mədar eyləsə dövran,
Ümmətin bürcün əgər seyli-nifaq eyləsə viran,
Qıldı aləmləri din bürcinə me'mar Mühəmməd,
Güli-rüxsari-Mühəmməd.

İstədi milləti çün kamil ola qeyri-miləldən,
Elmi-əbdan ilə məhfuz elədi xəlqi xələldən,
Qılmadı mən' cəhan əhlini hər xeyr əməldən,
Eylədi hər kəsi öz elminə muxtar Mühəmməd,
Güli-rüxsari-Mühəmmiəd.

## ƏFRAD

Həzar şükr Xudavəndgari-mə'budə,
Yetirdi firqeyi-islami eydi-mövludə.
Bu gün həkimi-əzəl aləmə zühur elədi,
Mərizxaneyi-dünyayə çün übur elədi.
Cəmi'i-illəti-əbdanü din üçün kafi,
Təbibi-rəhməti-Həq yazdı nüsxeyi-şafi.
Əgər qəvaidü qanuni bab-bab yazım,
Zərurdur ona şərh ilə min kitab yazım.

Dedi Rəsul: "Min əl-mai küllü-şey'in həyy",[*]
Tapar su ilə cəhanda həyat hər bir şey.
Cəmi'i-qeyri-miləl indi eyləyir iqrar,
Gərək su ilə olunsun əlac hər bimar.

## ƏL-BAQİYİ-HİKMƏT

Gündə beş dəf'ə müəyyən eləyib qüslü təharət,
Yə'ni təcdidi-vüzu' ilə şəhənşahi-hidayət,
Nəzmi-qanuni onun aləmədir tibbi-səadət,
İndi məkşuf olunur hikməti-əsrari-Mühəmməd,
Güli-rüxsari-Mühəmməd.

Qıldılar çünki həkiman ona diqqətlə nigahi,
Gördülər məxzəni-əsrardır əhkami-ilahi,
Nüsxədir illəti dəf' etməyə hər əmrü nəvahi,
Can verir hikmətilə aləmə göftari-Mühəmməd,
Güli-rüxsari-Mühəmməd.

Qüdsiya, eylə nəzər diqqətilən elmi-yəqinə,
Qıldılar sərvət ilən cani fəda sərvəri-dinə,
Sən də lütfünlə elə xidmətini mehri-mübinə,
Olur üqbadə sana yarü məzədkar Mühəmməd,
Güli-rüxsari-Mühəmməd.

*1907*

## DUAYİ-MƏCLİS

Deyin, ey talibani-rahi-nicat,
Uca səslən: "Mühəmmədə sələvat".
Mən dua eyləyim, ey əhli-yəqin,
Siz deyin sidqi-qəlbilən "Amin!"
Barilaha, bizə inayət eylə,
Layiqi-bəzmi-xasi-rəhmət eylə.
Elm ilən aləmi qılaq pürnur,
Zülməti-qəflətü cəhaləti dur.

---

[*] Su hər şeyə həyat verir.

Dini-islami bərqərar eylə,
İttihad ilə paydar eylə.
Qəflətü cəhlə adət eyləməyək,
İki qardaş ədavət eyləməyək.
Ver ümurati-mülki-dinə rəvac,
Olmayaq qeyri-millətə möhtac.
Şahi-aliməqam hörmətinə,
Çaryari-kiram hörmətinə.
Eylə, ya rəbb, behəqqi-nuri-Hüseyn,
Üləmayi-müvəffəq dareyn.
Bizə lütfü inayət eyləyələr,
Rahi-Həqqə hidayət eyləyələr.
Şəhri-imanı eyləyək abad,
Ola qəlbi-Rəsul bizdən şad.
Sala hər kəs bu ittifaqə nifaq,
Ona zindan ola cəm'i-afaq.
Görməsin səhəti-behişti-nəim,
Ola nari-cəhim içrə müqim.
Verə hər kəs ümuri-dinə rəvac,
Qoygilən rəhmətinlə başına tac.
Eyni-xurşid yenə qərin olsun,
Müstəfa ilə həmnişin olsun.
Məclisi-Qüdsidə məqam eləsin,
Sağəri-işrətin müdam eləsin.
Müstəcab olmağa duayi-nicat,
Oxuyun həmdü surəvü sələvat.

*1907*

## TƏŞƏKKÜRNAMƏ

Neçə gün arizini etdi cəhan,
Eylədi pərdeyi-qeybətdə nihan.
Tiri-ahim fələyə qıldı sə'ud,
Bari-möhnət qədimi qıldı kəman.
Əxtəri-feyzimə bəxt oldu qərin,
Eylədi övcdə sə'dinə qiran.

Tökdi saqi yenə minasından
Sağəri-qəlbimə yaquti-rəvan.
Gərçi pir etmiş idi qüssə məni,
Nəş'eyi-zövqi onun qıldı cəvan,
Qəflətin Əhrimənin qıldı həlak,
Xatəmin tapdı Süleymani-zəman.
Cilveyi-mehrinə əbr etmədi tab,
Eylədi nurini xurşid əyan.

Hicri olmuşdu əgər zəhri-məmat,
Vəsli əcsamə verir "Tazə həyat".

Fəxti-millət* elədi aləmə cud,
Yavər olsun ona xəllaqi-vədud.
Qövmi-islami tutubdur mənzur,
Eylədi lütf o mərdi-məs'ud.
Xəlqi asudə qılıb, hasil edib,
İki aləmdə rizayi-mə'bud.
Versə hər şəxs əgər millətə xeyr,
Bil, həqiqətdə odur əsl vücud.
Elm ilən milləti ehya eləyir,
Etməsin cəhl bu qövmi nabud.
Əkdi himmətlə səxavət şəcərin,
Eylədi şaxələri ərşə səud.
Gör necə eylədi məxluqə səxa,
Tutdu afaqi yenə bangi-sürud.

Hicri olmuşdu əgər zəhri-məmat,
Vəsli əcsamə verir "Tazə həyat".

Kaşifi-sirri-dəqayiqdir bu,
Naşiri-əmri-xəlayiqdir bu.
Kürreyi-ərzdə hər sübhü məsa,
Xəlqə kəşşafi-həqayqdir bu.
Qoymaz avarə qala xəlqi-cəhan,
Qütbi-pərgari-əlayiqdir bu.
Danışır çünki fəsahətlə kəlam,

* Hacı Zeynalabidin Tağıyev həzrətlərinə, etdiyi çox xidmətlərə görə, türk milləti tərəfindən kəmali-iftixar ilə verilən ləqəbdir (Ə.M.)

Ürəfa bəzminə layiqdir bu.
Xoş gəlir Xosrovi-Şirin hərəkat,
Şəkərin şəhdinə fayiqdir bu.
Dürci-gövhərdir onun hər sətri,
Elm sərrafinə şayiqdir bu.
Həft iqlimdə xurşid kibi,
Yari-ərbabi-həqayiqdir bu.

Hicri olmuşdu bizə zəhri-məmat,
Vəsli əcsamə verir "Tazə həyat".

Elmi-xurşid verir aləmə nur,
Elmdir canə verən zövqü sürur.
Hər bina elmilə olsa möhkəm,
Eyləməz məhv onu seylabi-dəhur.
Mə'nəvi mövtə giriftar idi xəlq,
Elmsiz cismdir, əlbəttə, qübur.
Ədəbü elmə çağırdı xəlqi,
Çaldılar əhli-səfa nəfxeyi-sur.
Çərxi-himmətdə o xurşidi-vəfa,
Eylədi xəlqə təcəllayi-zühur.
Bəndədən lütfini kəsməz Xaliq,
Xəlq əgər şakir ola, ya ki kəfur,
Baniyi-xeyrə iki aləmdə,
Eyləsin lütf Xudavəndi-qəfur.

Hicri olmuşdu bizə zəhri-məmat,
Vəsli əcsamə verir "Tazə həyat".

Millətin rövnəqinə himmət edin,
Baxıb əğyarlərə, ibrət edin.
Müstəqil illətdir cəhlü cəfa
Ki, onun dəf'inə siz sür'ət edin.
Cəhldən naşi olur zülmü nifaq,
Sidq qəlbilə hamı ülfət edin.
Gər ədavət eləsə firqeyi-amm,
Məclisi-ammə onu də'vət edin.
Cüz'i himmətlə, əya qövmi-giram,
Təb'ü nəşrə çalışıb qeyrət edin.

Hər cəridə sizə bir ayinədir,
Meyli-didari-qəmərtəl'ət edin.
Bilməyə hali-dili-əhbabi,
Şərqdən Qərbilə siz söhbət edin.

Hicri olmuşdu bizə zəhri-məmat,
Vəsli əcsamə verir "Tazə həyat".

Görməsə aşiq əgər hicrü məlal,
Dərk etməz nədir əyyami-vüsal.
Ləzzəti-vəsli bildirmək üçün
Oldu pünhan neçə ay mehri-cəmal.
Gülşəni-canədir əxbari-cərid,
Çeşmeyi-rəhmətdən abi-zülal.
Aləmə müşk verir ahuyi-Çin,
Seyr edər Çinə bu müşkin qəzal.
Hər səhər aləmi pürnur eləyir,
Zülməti dəf' qılır mehrmisal.
Eyləyir şad könül Xosrovi-din,
Bəzmi-xəlvətdə bu şirinməqal.
Fələki-Qüdsidən oldu zahir,
Eyd olmaqlığa əbruyi-hilal.

Hicri olmuşdu bizə zəhri-məmat,
Vəsli əcsamə verir "Tazə həyat".

*1907*

## YA MÜ'İNÜL-MÜSLİMİN!

Qadirü xəllaqü əllamü vədud,
Etməyibdir bəndəsindən qət'i-cud.
Bu sözə iqrar edər hər xasü amm,
Lütfi-həq afaqə nazildir müdam.

Şəmsi-aləmtab edir izhari-nur,
Cilvəsi ayinədən eylər zühur.
Qəlb mir'atın gərək pak eyləyək,
Qabili-tə'limi-idrak eyləyək.
Gördülər çünki xəzan olmuş çəmən,
Xar olubdur əndəlibani-vətən.
Məclisi-"Nəşri-Məarif" qıldı cud,
Lütf qılsın onlara Rəbbi-vədud.
Açdılar bir çərx tək darül-ülum,
Oldular çərxə müəllimlər nücum.
Mehr tək Hafiz əfəndi verdi nur,
Nuri-elmi dəmbədəm oldu zühur.
Şeyxzadə sə'yü himmət eyləyir,
Elmilən xəlqi hidayət eyləyir.
Həm Əfəndizadə danayi-cəhan,
Mirzə Yusif eyləyir şərhü bəyan.
Göstərir taliblərə rahi-nicat,
Hüsni-xülqi eyləyibdir xəlqi mat.
Eyləyir tə'limi-tədrisi-cədid,
Elm qanunin edir hər dəm məzid.
Mehri-alihimməti-ruyi-zəmin,
Fəxri-millət Hacı Zeynəlabidin.
Gəldi darül-elm, mərdi-xoşnihad,
Eylədi elm əhlini məsrurü şad.
Bakəmalü mərhəmət alicənab,
Qövmi-islamə belə qıldı xitab:
Dinü əbdan elmini əhli-vəfa,
Eyləyib vacib cənabi-Müstəfa.
Bizlərə vacib olubdur elmi-din,
Elmdən eylər bizi əhli-yəqin.
Elmi-din xurşidi-pürənvardır,
Olmasa xurşid, aləm tardır.
Tapşırıb dünyavü üqbani bizə,
Elmi-əbdan ilə ədyanı bizə.
Bu sözə iqrar edər əhli-kəmal,
Elmü sərvətlən olur əfzun hal.
Əbri-zillət olsa xurşidə hicab,
Pəs qılır zülmətdə qürsi-afitab.

Elmsiz millət həmişə xəstədir,
Çarəsi simü zərə vabəstədir.
Əhli-dil, bu nüktədir cani-kəlam,
Elmi-əbdandır sənaye'lər təmam.
Biz həman millət deyildik, müslimin,
Bizdən eylərdi həras əhli-zəmin.
Hansı illət bizləri qıldı zəif,
Düşdü dami-zillətə qövmi-şərif.
Gərçi zahirdir sizə sirri-nihan,
Mən də indi eylərəm şərhü bəyan,
Əhli-Məğrib elmilən oldu qəni,
Yetdi övci-izzətə qövmi-dəni.
Sərvətilə verdilər əmrə rəvac,
Rəf' oldu səddi-fəqrü ehtiyac.
Sərvət ilən məmləkət mə'mur olur,
Mülk mə'mur olsa, zillət dur olur.
Olsa hər millətdə gər elmü kəmal,
Olmaz o millət cəhanda payimal.
Cəhlü qəflət qıldı islami zəlil,
Qaldılar zillətdə bu qövmi-cəlil.
Cəhldir bais ədavət qıldılar,
Bir-birilən tərki-ülfət qıldılar.
Cəhldir bais belə zar olmuşuq,
Eyni-zillətdə qalıb xar olmuşuq.
Oldular amadə hər qövmü miləl,
Bu zəman elm ilədir cəngü cədəl.
Çar canibdən gəlir seylabi-qəm,
Az qalıb əhli-vücud olsun ədəm.
Ey müəllimlər həmiyyət eyləyin,
Elmilən ehyayi-millət eyləyin.
Sədd lazımdır bəla yə'cucinə,
Salmasın ta rəxnə həqqin fövcinə.
Müddəti-tə'lim üçün vəqti-mədid,
Qoymadı qalsın bu üslubi-cədid.
Qətrə gər olsa sədəf içrə müqim,
Bəhri-elm eylər onu dürri-yetim.
Millətin mətlubi tez hasil olur,
Mənzili-məqsudinə vasil olur.

İttihad ilə qılın dəf’i-fəsad,
Eyləyin ruhi-rəsuli-Həqqi şad.
Hər nə lazım olsa, biz qıllıq əda,
Siz də məxluqi qılın elmə səda.
Siz ucaldın ərşə dinin beyrəqin,
Artırın aləmdə rəngü rövnəqin.
Əndəlibi-gülşəni-Qüdsi-cəlal,
Eyləsin gülzardə şirin məqal.
Lütfi-Həq olsun bizə yarü mü’in,
Siz deyin amin, güruhi-mö’minin.

*1907*

## MİNACAT

Xudavənda, kərima, girdigara,
Rəhima, qadira, pərvərdigara.
Gəlib dərgahına miskini-məğmum,
Kərim etməz gədayi-zari məhrum.
Xudavənda, biz ətfali-zəlilik,
Təmamən dərdi-cəhl ilə əlilik.
Gəlib möhtaclar babi-kərimə,
Təbiba, sən əlac eylə səqimə.
İlahi, zülməti-cəhli fəna qıl!
Bizi ənvari-elmə aşina qıl!
Açılsın qeybdən əbvabi-ehsan,
Ola hər dərsi-müşkül səhlü asan.
Cəhanda elm olubdur taci-şahi,
Əta qıl ta qoyaq başə, ilahi!
Elə mir’ati-qəlbi jəngdən pak,
Olaq aləmdə sahibi-elmü idrak.
Elə, yarəb, bizi əhli-bəsirət,
Görünsün bizlərə nuri-həqiqət.
Xudavənda, əta qıl hüsni-əxlaq,
Olaq xurşid tək məşhuri-afaq.
Olur insanda çün rəhmü mürüvvət,
Edər əbnayi-millətlən müvəddət.

Həqiqətdə olaq övladi-adəm,
Əziyyət görməsin məxluqi-aləm.
Yetir, yarəb, məni mehri-nicatə,
Verək ta xeyr xəlqi-kainatə.
Ədəmdən aləmi götdün vücudə,
Vücud əhli olub möhtac cudə.
Xudavənda, bizi məğmum etmə,
Kəmali-cuddən məhrum etmə.
Açıldı aləmə sübhi-səadət,
Göründü qürsi-xurşidi-hidayət.
Təcəlla eylədi rüxsari-Qüdsi,
Vəlakın qaldı giryan, zar Qüdsi.

*1906*

## MÖVLUDİ-NƏBİ

Əmr qıldı lütf ilən Rəbbi-cəlil,
Hurilər getsin yerə, ey Cəbrəil.
İstəyir zahir ola nuri-səfa,
Mehri-tabani-nübüvvət Müstəfa.
Feyzim əvvəldə ona olmuş nəsib,
Çün həbibimdir, həbibimdir, həbib.
Ənbiyanın gözlərinə nurdür,
Cümlə peyğəmbərlərə mənzurdür.
Çün budur peyğəmbəri-axırzəman,
Feyz alır bundan hamı xəlqi-cəhan.
Saldı Əhməd ta cəmalından niqab,
Cilvələndi nuri-qürsi-afitab.
Çün qədəm basdı cəhanə şahi-din,
Ərşdən qıldı nida ruhül-əmin.
Ey cəmaət, nuri-sərməddir gələn,
Afitabi-din Mühəmməddir gələn.
Oldu rövşən-övci-taği-nöh fələk,
Endilər göydən yerə fövci-mələk.
Açdı yulduzlar təmaşayə gözün,
Ta ki, görçünlər o xurşidin yüzün.

Eydi-mövludi-şəhənşahi-zəman,
Firqeyi-islami qıldı şadman.
Vəhy ilən çaldı neyi-vəhdət nəva,
Şur ilən doldu təmamən masiva.
Beydəqi-islamü təkbirin səsi,
Tutdu övci-taği-ətləsi.
Qoydu bir qanun qütbi-ruzigar,
Həşr olunca seyr edər pərgarvar.
Əndəlibi-gülşəni-Qüdsi-cəlal,
Zaği-cəhli eylədi elmilə lal.

*1906*

## HEKAYƏTİ-MƏNZUMƏ

## ATA VƏ OĞUL

Xosrovi-elmdən rəvayətdir,
Xeyli şirin bir hekayətdir.
Vardı bir taciri-həmidəxisal,
Şəhri-Bəğdaddə beizzü cəlal.
Adı Sadiqdi, nadiri-əyyam,
Xəlq tə’rifin eyləyirdi müdam.
Talibi-namü şanü şövkət idi,
Sahibi-mülkü malü dövlət idi.
Eyləmişdi o mərdi-pakzəmir,
Hüsnü xülq ilə aləmi təsxir.
Hər sifatə səxası faiq idi,
Qapısı mərcəi-xəlayiq idi.
Bu qədər mülkü malü dövlət ilən,
Ehtiramü cəlalü şövkət ilən.
Yoxdu bir zərrə onda kibrü qürur,
Mehr tək toprağə salırdi nur.
Mah əgər əksini sala abə,
Nəqs olmaz məhi-cəhantabə.
Baş qoyar su ağac əyağinə,
Rişədən seyr edər budağinə

Ki, həman sudur aşikar olmuş.
Fərqi-şax üzrə bərgü bar olmuş,
Tütün olsa gər səmayə bülənd,
Sala bilməz fərazi-çərxə kəmənd.
Yetməz övci-cəlalə, zar olur,
Tökülür topraq üstə, xar olur.
Ücb insanı müstəmənd eylər,
Helm aləmdə sərbülənd eylər.
Kibr ilən gör təvazö'ün əsərin,
Dəsti-himmətlə dərgilən səmərin.
Sadiqin vardı bircə fərzəndi,
Yoxdu ondan səvayi dilbəndi.
Adı Baqiydi, ta ola xələfi,
Çün atanın oğul olur şərəfi.
Can nihalinədir səməri-övlad,
Eyləyirdi onunla qəlbini şad.
Cümlə aləm gözündə faniydi,
İsmi-Baqi sərvəri-caniydi.
Hər zəman ki, deyərdi "ya Baqi!"
Yox hesab eyləyərdi afaqi.
Çatdı səkkiz yaşına zöhrəcəbin,
Növbəti-kəsbi-elm oldu qərin.
Dedi, ey nonihalı-baği-ədəb,
Sənə mənzil gərək ola məktəb.
Məktəbə cümlə xəlq şaiqdir,
Qibleyi-hacəti-xəlayiqdir.
Baxsa hər kəs əgər gülüstanə,
Meyl qılmaz riyazi-bostanə.
Vərəqi laləzari-hikmətdir,
Cədvəli cuybari-rəhmətdir.
Hər tərəfdən açıbdular pərü bal,
Gülşəni-elmə bülbülani-kəmal.
Sən də, oğlum, olara həmraz ol!
Bağə get bülbüli-xoşavaz ol!
Ey oğul, dərs ilən kəmal artar,
Hörmətü izzətü cəlal artar.
Elmilən sahibi-liva olusan,
Elmilən xəlqə pişva olusan.

Elmilən məmləkət olur mə’mur,
Elmilən canü dil olur məsrur.
Elmilən oldu ənbiyayi-giram,
Rəhnümayi-xəlayiqi-əyyam.
Sə’y qıl sahibi-kəmal olasan,
Layiqi-məsnədi-cəlal olasan.
Dövlətü malə e’tibar olmaz,
Ömr tək hiç paydar olmaz.
Ey oğul, qoyma fövt ola fürsət,
Yoxsa əldən gedər belə ne’mət.
Atası eylədi kəlami təmam.
Dedi oğlu, əya əziz-atam,
Hər qədr yaxşı eyləsən təqrir,
Ey ata, eyləməz bana tə’sir.
Bana lazım deyil ülumü ədəb,
Gər behişti-bərin ola məktəb.
Atası gördi cəhldir fayiq,
Ona zülm eyləmək deyil layiq.
Dedi, get seyri-bağə, nuri-bəsər,
Elmə talib olanda eylə xəbər.
Ona qonşu idi bir fəqir yetim,
Maili-fəzlü elmü zövqi-səlim.
Dərsə hərçənd rəğbəti çox idi,
Elm kəsb etməyə pulu yox idi.
Şahbaz idi şəhpəri, bəstə,
Qalmışdı zəlil xak üstə.
Qüdrəti yoxdu ta şikar eləsin,
Hünərin xəlqə aşikar eləsin.
Adı Hadiydi yari-həmrazi,
Baqi ilən edərdilər bazi.
Ona yarü ənisü həmdəm idi,
Cümlə əsrarinə o məhrəm idi.
Dedi bir gün ona, əya Baqi,
Elm nuri tutubdur afaqi.
Nə qədr eyləyək bu növ’i mədar,
Gəl gedək məktəbə vəfagirdar.
Qorxuram əks ola mədari-zəman,
Yetişə fəsli-nobəhari-xəzan.

Sahibi-elm olan yetim olmaz,
Gülşəni-eyşi fəqr ilən solmaz.
Biədəbdir yetim dünyadə,
Görəcəkdir əzab üqbadə.
Dedi Baqi, bana deyil lazim,
Elmə talib sən olgilən azim.
Lüfti-Həq oldu halinə şamil,
Məktəbə getdi Hadiyi-aqil.
Çün müəllim görüb onun şövqün,
Kəsbi-elmü kəmal üçün zövqün,
Dərs bəhsində etmədi tə’til,
Neçə ildə təmam olub təhsil.
Sür’əti-seyr ilən hilali-kiram,
Şəhri-izzətdə oldu bədri-təmam.
O yetimü zəlilü sərgərdan,
Oldu bir fazili-vəhidi-zəman.
Dövlətü izzəti ziyad oldu.,
Qəmü möhnət qutardı, şad oldu.
Elm onu xəlqə ərcümənd elədi,
Şəms tək xəlqə sərbülənd elədi.
Elmdir afitabi-ərşi-nicat,
Elmdir Xızri-eşqə abi-həyat.
Baqinin ərz eyləyim halini,
Biləsüz ta ki, axır əhvalini.
Baqi on yeddi il mədar elədi,
Mənzilin bağı-laləzar elədi.
Ona həmdəmdi tar ilən mizrab,
Çaldırırdı həmişə çəngü rübab.
Bilməyirdi cəhandə şəhraşub,
Övci-mənsurini edər məğlub.
Dövri-gərdun müxalif etsə mədar,
Bürci-möhnət olur vücudə həsar.
Atası Sadiqi-həmidəxisal,
Gecə-gündüz edərdi fikrü xəyal.
Oğlunun yoxdi elmi-mətbu'i,
Etmədi kəsbi-elmi-məsmu'i.
Atasız qaldı heyf ola övlad,
Edəcək malü sərvəti bərbad.

Qəmi-fərzənd aldı taqətini,
Yıxdı toprağə sərü qamətini.
Axmadı bağə cuybari-həyat,
Qıldı tə’sir cismə zəhri-məmat.
Binəva çəkdi ahi-atəşbar,
Oğlu Baqini eylədi ehzar.
Baxdı rüxsarinə gözi pürab,
Eylədi oğluna bu növ’ xitab:
Eylərəm həmd girdigarə müdam,
Doxsan il eylədim cəhandə məqam.
Nə qədr gərdiş etdi mah ilə sal,
Qonmadı qəlbimə qübari-məlal.
Bəndeyi-zari qadirü qəffar,
İndi eylür hüzurinə ehzar.
Var ümidim kərimü rəhmanə,
Rəhm eylər qərib mehmanə.
Naxoşü natəvanü zarəm, oğul,
Gedirəm səndən intizarəm, oğul.
Yanıram halına, cəvan oğlum,
Cəhlü qəflətdə natəvan oğlum.
Görürəm bağı-işrətin solacaq,
Bilmirəm axırın nə növ’ olacaq.
Sən özün növcəvan, dövlət çox,
Pis rəfiqlərdə hiç mürvət yox.
Səni bəhri-bəlayə salmaq üçün,
Mülkü mali əlindən almaq üçün.
Edəcəklər yəqin o qövmi-şərir,
Çox fünun ilə hiyləvü tədbir.
Deyəcəklər ki, məclisarasən,
Hər sifatü kəmalə darasən.
Hüsni-surətdə Yusifi-Kən’an,
Eyni-mə’nadə Hatəmi-dövran.
Biz qulamıq sənə besidqi-təmam,
Nədir əmrin buyur ağayi-giram.
Baxma zahir də gər müvafiqdir,
Ey oğul, cümləsi münafiqdir.
Gedəcək malü sərvətin, bilirəm,
Batacaq mehri-izzətin, bilirəm.

Qalacaqsan məqami-heyrətdə,
Zülmətü qəflətü məzəllətdə.
Sərvətin çünki paymal oldu,
Qismətin möhnətü məlal oldu.
Gər xilas olmaq istəsən qəmdən,
Gedəsən təngnayi-aləmdən.
Eyləyim ölməyi sənə tə'lim,
Çox asanlıqla canı qıl təslim.
Aparıb oğlunu o xoşrəftar,
Xaneyi-xəlvət içrə tutdu qərar.
Dedi, oğlum, bu tağə eylə nəzər,
Ey əzizi-girami-xoşmənzər.
Səqfdən gör bu risman asılıb,
Canına rişteyi-aman asılıb.
Bu ipi sal boğazına, oğlum,
Yetişirsən niyazına, oğlum.
Əmrimə eyləsən əgər taət,
Olusan bir dəqiqədə rahət.
Qurtararsan bəlayi-möhnətdən
Ki, çıxarsan fəzayi-zülmətdən.
Cuy tək gülşənə rəvan olusan,
Bağı-cənnətdə şadman olusan.
Çıxdı evdən o sahibi-hikmət,
Qapını möhr edib, qılıb ric'ət.
Bir neçə gün bu qism qıldı mədar,
Qaldı çün qutbi-seyrdən pərgar.
Cilvələndi ona riyazi-səfa,
Olmadı paybəndi-dami-cəfa.
Tayiri-ruhi eylədi pərvaz,
Oldu bağı-behiştə nəğmətəraz.
Ölməyin çün eşitdi əhli-fəsad,
Məclisi-qəmdə oldular dilşad.
Geydilər qarə sinəzən bahəm,
Gəldilər əldə tövqü səncü ələm.
Va müina, sədası oldu bülənd,
Saldı tağı-büləndi-çərxə kəmənd.
Nə'şini çox cəlalü şövkət ilən,
İzdihami-təmami-kəsrət ilən

Etdilər dəfn, gəldilər yaran,
Məclisə cəm’ oldu əyyaran.
Hər gecə iki yüz o qövmi-bələd,
Məhfili-eyşdə edərdi mədəd.
Dedilər Baqiyə o qövmi-pəlid,
Yaxşı ehsan elə, cəvani-rəşid.
Sən kibi yoxdur, ey əzizi-giram,
Bəzmi-bəxşişdə Hatəmi-əyyam.
Ruhi-pakini hər gecə yad et,
Eylə ehsan, qəlbini şad et.
Biz sənə rəhnüma olan yarıq,
Qəm günündə müini-qəmxarıq.
Dedi Baqi, fəqir olan kimdir?
Fəqrdən gülşəni solan kimdir?
Dedilər, çoxdur, ey əziz, fəqir,
Adların lövhə etmişik təhrir.
Əhli-dildir o qövmi-paksirişt,
Layiqi-qəsri-zərnigari-behişt.
Hər biri çün Əbazərü Səlman,
Aqilü mö’minü fəqihi-zəman.
Hiyləni bilmədi cəvani-kiram,
Olara verdi pul bezövqi-təmam.
Dedi, mö’minlərə edin qismət,
Atamın mənzili ola rahət.
Hər gecə yüz qızıl o qövmi-lə’im,
Füqərayə edirdilər təslim.
Ta əza məclisi təmam oldu,
Növbəti-şurişi-qiyam oldu.
Dedilər bir gecə o qövmi-lə’am,
Bakəmalü məharətü aram.
Neçə şeydir ki, paydar olmaz,
Qurtarır hiç bərqərar olmaz.
Hər kişi talibi-rəyasətdir,
Rövnəqi-səltənət siyasətdir.
Bilir aləm bu sirri-pünhani,
Bəhssiz elm tez olur fani.
Dedi axırda çox məharət ilən,
Mal əfzun olur ticarət ilən.

Qoyma gəncinədə qala dövlət,
Tez olur fani kəsbsiz sərvət.
Ver bizə, eyləyək xəridü füruş,
Sən otur nəf’ cür’əsin eylə nuş.
Mənfəət dəftərin sipehri-cənab,
Saxla sən, aybaay yazılsın hesab.
Hər nə əltaf qıldı Rəbbi-kərim,
İl başında sənə edək təslim.
Övc edər çərxə nəcmi-iqbalın,
Neçə milyon olur sənin malın.
Dedi çün bu sözi həmiyyət ilən,
Çaldılar əl o qövm şiddət ilən.
Əndəlibani-laləzari-məcaz,
Dedilər bu sözi beləhni-Hicaz:
Ey ağa, dövlətin ziyad olsun,
Dustlər məclisində şad olsun.
Sənə Allah əta edə sərvət,
Yeyə məxluqlər ola rahət.
Aldılar cümlə malını əldən,
Eyni-şə’nü cəlalını əldən.
Ay başında gəlirdi əhli-cəfa,
Ərz edərdi, əya, sipehri-vəfa
Ki, bu ayda bəduni-kəsrü ziyan,
Altı yüz min mənafe’ oldu əyan.
Hər biri hiylələr edib cari,
Boşgilə dodururdu ənbari.
Dedilər, ey əzizi-xeyrünnas,
Sənə lazımdu bir təamü libas.
O da hər gündə, ey sipehri-mütaf,
Gəlü bazardan beqədri-kifaf.
Qoyma sənduqdə qala gövhər,
O qərəzdir xərid-füruş cövhər.
Eyni-fəsli-bəhardır gülzar,
Ağazadə, rəvacdır bazar.
Müxtəsər hər nə vardı gövhərü sim,
Aldılar Baqidən o qövmi-lə’im.
Müntəzirdi hamı kənizü qulam,
Gündə bazardən gəlirdi təam.

Gördilər onda qalmadı zərü mal,
Etdilər hökm firqeyi-əzlal.
Eylədik mülkü malını tarac,
Verməsinlər səfihə mayəhtac.
Qıldılar daği-zülmilən yürəgin,
Kəsdilər xanədən yavan çörəgin.
Qaldı əhli-əyalü külfəti ac,
Tapmadı dərdi-ehtiyacə əlac.
Getdi dildarü aşina yanına,
Zahirən yarü əqrəba yanına.
Dedi, bərhəm olubdur əhvalım,
Ac qalıbdır əyalü ətfalım
Ki, xəcalətdən əşkbar oldum,
Rəhm edin, çün zəlilü xar oldum.
Dedilər, ey səfihi-sərgərdan,
Bir zərrə etmərik sənə ehsan.
Bilmədin malü dövlətin qədrin,
İzzətü şanü şövkətin qədrin.
Sənə layiq deyildi pul əlhəq,
Qılmadın kəsbi-elm, ey əhməq.
Get atan dərdinə əlac eləsin,
Təxti-izzətdə əhli-tac eləsin.
Tə’nədən yandı qəlbi zarü həzin,
Mənzilinə qayıtdı ol qəmgin.
Çünki şərməndə oldu külfətdən,
Təngə qaldı cəfavü zillətdən.
Özün öldürməyə olub mail,
Xaneyi-xəlvətə olub daxil.
Qıldı suzü güdazın bəndə,
Tutdu yüz dərgəhi-Xudavəndə.

## BAQİNİN HƏQQ-TƏALA DƏRGAHİNƏ MÜNACATİ

Kəmali-sidq ilən etdi münacat,
Belə qıldı Xudayə ərzi-hacat.
İlahi, rəhm elə mən binəvayə,
Məni dövri-fələk saldı bəlayə.

Təbiba, gör necə zarü əliləm,
Əlac eylə bənə, yarəb, zəliləm.
Məni yoxdan sən etdin çünki icad,
Elə bu bəndeyi-qəmgini dilşad.
Kəməndi-möhnətə oldum giriftar,
Deyil bir şəxs halimdən xəbərdar.
Mənə zülm eylədi qövmi-cəmaət,
Əlimdən çıxdı mülkü malü sərvət
Ki, üç gündür olub aşiftə halım,
Qalublar evdə ac əhli-əyalım.
Xəzanə yetsə kim fəsli-baharım,
Qalır xarü yetim ətfali-zarım.
İlahi, sənsən aləmdə pənahım
Ki, səndən qeyri yoxdur dadxahım.
Xudaya, qalmışam giryanü nalan,
Rizasən mən bu halilə verim can?
Xətm qıldı niyazı xah nəxah,
Dedi, bəs, lailahəilləllah.
Bir qədər qamətini qıldı bülənd,
Boynuna rismani eylədi bənd.
Qopdu təxtə yıxıldı dilxəstə,
Səqfdən pul töküldü xak üstə.
Neçə milyon cəvahirü zərü sim,
Orda cəm' eyləmişdi mərdi-əlim.
Lövhün üstə o mərdi-pürtədbir,
Bu sözü eyləmişdi həm təhrir:
Xeyr işə, ey oğul, iqdam!
Dəxi lazım deyil ziyadə kəlam.
Olmadı çün nəsihətin səməri,
Sənə bəsdir müsibətin əsəri.
Pulları görcəgin o mərdi-qəyur,
Səcdəyə getdi badili-məsrur.
Ne'məti-Həqqə qıldı şükranə,
Girdigarü rəhimü sübhanə.
Durdu ordan gedib məzar üstə,
Xar olan mahi-gülüzar üstəö
Bir dolandı o qəbrə badili-zar
Böylə ərz eylədi o diləfkar:

## NÖVHƏ

Ey məzar içrə yatan yarü vəfadarım ata!
Ey pərəstarım ata,
Yarü qəmxarım ata.
Məhşərə qaldı heyf ola didarım ata,
Ey pərəstarım ata,
Yarü qəmxarım ata.
Gəlmişəm qəbrinin üstündə edim ahü fəğan,
Eyləyim halı əyan
Sənə, ey ruhi-rəvan.
Eylədin lütf bənə mehri-pürənvarım ata,
Ey pərəstarım ata,
Yarü qəmxarım ata.
Sərvətin qədrini bildim dəxi bundan belə mən,
Sərvəri-əhli-zəmən,
Sərvi-gülzari-çəmən.
Qoymaram xərc ola bica yerə dinarım ata,
Ey pərəstarım ata,
Yarü qəmxarım ata.
Nobəhari-kərəmü mərhəmətin oldu zühur
Eylədi möhnəti dur,
Qəlbimi tutdu sürur.
Qoymadı cövri-xəzanda qala gülzarım ata,
Ey pərəstarım ata,
Yarü qəmxarım ata.
Sülsi-malı verərəm məclisi-xeyriyyəyə çün,
Qalmadım zarü zəbun,
Dövlətim oldu füzun.
Aqibətdə olacaq yarü mədədkarım ata,
Ey pərəstarım ata,
Yarü qəmxarım ata.
Cilvələnsin fələki-Qüdsidə xurşidi-səxa,
Qala ta ruzi-bəqa,
Tuta afaqi ziya.
Kürreyi-ərzdə baqi qala asarım ata
Ey pərəstarım ata,

Yarü qəmxarım ata.

*1906*

* * *

*Dağıstanda iqamət edən islam qardaşlarımızın Badkubə şəhrində İmam Hüseyn əleyhissəlamə təziyə tutmaqlarının əyanında sərvəri-qəlbi və nuri-dideyi-Mühəmməd əl-Müstəfa (s.ə.) Fatimeyi-Zəhra əleyhasəlamı özlərindən razı eyləmələrinin bəyanındadır.*

Sipehri-şəri'də şəmsü qəmərdir əhli-ülum,
Güruhi-milləti-islamdır süfufi-nücum.
Həmişə mehrdən əncümlərə inayət olur,
İnayət eyləmək əhli-səfayə adət olur.
Görünməmişdi bu növ' ilə ittifaqi-ənam
Ki, etdilər üləmalər bu xeyr işə iqdam.
Vücudi-millətə yetmişdi gərçi zəhri-məmat,
Verildi zülməti-heyrətdə Xızra abi-həyat.
Nəsimi-rəhməti-Həq əsdi babi-cənnətdən,
Oyatdı firqeyi-əshabi xabi-qəflətdən.
Bizi hidayət edən müftilər edib himmət,
Əza məclisinə cəm' oldular ümmət.
Cəhanə şurü nəva saldı ruzi-aşura,
Zühur eylədi aləmdə məhşəri-kübra.
Təmam əhli-Dağıstan Hüseynə tutdu əza,
Müin ola olara padşahi-ruzi-cəza.
Fərazi-ərşə yetişdi o gündə şivənü şeyn,
Deyirdilər hamı matəmdə, ya Hüseyn, Hüseyn.
Necə deyək sənə biz, ya şəfieyi-məhşər,
Başın sağ olsun, ölübdür Hüseyni-təşnəcigər.
Qalıbdır ərsədə üryanü xar gül bədəni,
Şüai-mehri-cəhantabdır onun kəfəni.
Qoyuldu məscidi-came'də xətm üçün Qur'an,
Verildi xəlqə Hüseyni-şəhid üçün ehsan.
Gəzərdi kuçəvü bazari firqeyi-qəmgin,
Bu növhəni oxuyurdu cəmaəti-şəhi-din:

## NÖVHƏ

Gövhəri-dürci-imamətdir Hüseyn!
Əxtəri-bürci-hidayətdir Hüseyn!
Cəddi-paki Əhmədü Məhmuddür,
Şafe'i-ruzi-qiyamətdir Hüseyn.
Nuri-çeşmi-zöhreyi-Zəhrayi-din,
Eyni-iman, ərşi-ismətdir Hüseyn!
Zülmətin afaqdən dur eylədi,
Mehri-pürənvari-millətdir Hüseyn!
Matəmində ağlayan görməz əzab,
Fatehi-əbvabi-cənnətdir Hüseyn!
Zülmilən öz qanınə qəltan olan
Sərvəri-bəzmi-şəhadətdir Hüseyn!
Gülşəni-Qüdsini sirab eylədi,
Cuybari-eyni-rəhmətdir Hüseyn!

*1906*

## CÜLUSİYYƏ

Cülus eylədi təxtə şahi-ümən,
Təzyin olub tacü övrəngi-Cəm.
Əlində tutub şir tiği-hilal,
Açıb şəqqeyi-fəthi mehri-ələm.
Olur xəlq asudə hər rəncdən,
Qurtardı o qanuni-cövrü sitəm.
Cəhan əhlini qıldı məsrurü şad,
Dəxi qalmadı qəlbdə fikrü qəm.
Yazıb təhniyətçün bu əfradimi,
Cəli xət ilən lövhün üstə qələm.

Səriri-ədalətdə tutdu qərar,
Məhəmmədəli şah gərduni-vüqar.

Bu şəh xəlqə lütf inayət edər,
İnayətilə kəsbi-səadət edər.
Nə qanun qoyub şahi-cənnətməkan,
O qanuni-əsas ilə adət edər.
Şəhənşahi aləmdə züliqtidar,
Bilir çünki icmai'-ümmət edər.

Müsavatü ədl ilə eylər qiyam,
Bu aləmdə şuri-qiyamət edər.
O xurşid cəzbi-qülub eyləsə,
Ona xəlqi-aləm itaət edər.

Kəvakib yəqin zivəri-mah olur,
Rəiyyətlə sultan şəhənşah olur.

Təcəllayə çün gəldi xurşidi-zat,
Münəvvər qılıb dəhri nuri-sifat.
Məhəmməddir aləmdə ərşi-səfa,
Əli ərşi-rəhmətdə mehri-nicat.
Rəsulə edib hökm pərvərdigar,
Eylə məşvərət sərvəri-kainat.
Ola ittihad ilə möhkəm bina,
Onu eyləməz münhədim mümkünat.
Müsavatdır məmləkət cisminə
Ki, ey Xızri-din, eyni-abi-həyat.

Məhəmmədəli din binasın qoyub,
Cəhanda bu qanun əsasın qoyub.

Bu xürşidi-tabani-ərşi-bərin,
O şahənşəhi-mülki-İranzəmin.
Təriqi-ədalətlə rəftar edər,
Olur qövmi-islamə yarü mü'in.
Xərab eyləməz mülki seylabi-zülm,
Çəkər ittihad ilə bürci-mətin.
Olur məhv zülmati-cövrü cəfa,
Tutar aləmi mehri-nuri-yəqin.
Edər məşvərətlən ümurə qiyam,
Necə hökm edibdir rəsuli-əmin.

Bu xurşid afaqi pürnur edər,
Qəmü zülməti mülkdən dur edər.

Zühur oldu afaqə ənvari-Qüds
Təcəlla qılıb mehri-rüxsari-Qüds.
Təravət verib gülşəni-aləmə,
Rəvan oldu gülzarə ənhari-Quds.
Müəttər qılıb aləmi sübhdəm,

Nəsimi-fərəhzayi-gülzari-Qüds.
Qutardı qəmü suzi-hicrandan,
Göründü bizə bəzmi-didari-Qüds.
Niqabın qılıb rəf' oldu əyan
Ki, xurşidi-tabani-dildari-Qüds.

Məhəmmədəli şahı pərvərdigar
Edə təxti-mövzundə bərqərar.

*1907*

## QƏZƏL

Göstərir arizini aşiqə dildari-kəmal,
Ey xoş ol aşiqə qismət ola dildari-kəmal.

Varmı bir əhli-bəsirət edə diqqətlə nəzər,
Cilvələnsin ona bin hüsn ilə rüxsari-kəmal.

Zülməti-cəhli edər saheyi-aləmdən dur,
Gər təcəlla edə xurşidi-pürənvari-kəmal.

Zilləti-fəqrdən aləmdə edər xəlqi xilas,
Açıla sə'y ilə gəncineyi-əsrari-kəmal.
Hiç olur daireyi-ülfətdən xəlq kənar?!
Qütbi-elmilə əgər seyr edə pərgari-kəmal.

Bülbülani-çəmənin zağü zəğən tutdu yerin,
O zəmandan ki, solub cəhlilə gülzari-kəmal.

Doğru söz zahir edən şəxsə olur xəlq ədu,
Çün deyil cəhlü cəfa əhli səzavari-kəmal.

Qüdsiya, elmi bizə vacib edib xətmi-rəsul,
Əhmədə millət olan eyləməz inkari-kəmal.

*1907*

## MƏDƏNİYYƏT

Tabəndədir afaqə cəmali-mədəniyyət,

Dünyanı tutub nuri-cəlali-mədəniyyət.

Zivərsiz olur arizi-gülrəngi-təkamül,
Ruyində əgər olmasa xali-mədəniyyət.

Sərçeşmeyi-rəhmətdən olub cari,
Can verməyə gülzarə zülali-mədəniyyət.

Ənva'i-ləzaizlə edər milləti məhzuz,
Əsmari-dilarayi-nihali-mədəniyyət.

Sultan qılar cümlə riayasını azad,
Gər bilsə nədir axır hali-mədəniyyət.

Şirinə necə meyl edərdi dili-Xosrov,
Görsəydi nədir hüsni-məqali-mədəniyyət.

Ey Qüdsi, olaydı məni-hicrankeşə qismət,
Bu əsrdə bir bəzmi-vüsali-mədəniyyət.

*1907*

## İNTİBAHİ-MƏARİFÜ SƏNAYE

Növki-qələmdən oldu rəvan cuybari-elm,
Övraqi-hər kitabi edər laləzari-elm.

Asudə oldu xəlqi-cəhan cövrü zülmdən,
Afaqi-kainatə çəkildi həsari-elm.

Sultani-ruzgardır aləmdə hər kəsin,
Fərqində vardır əfsəri-gövhərnigari-elm.

Zənciri-ədlə eylədi zülm əhlini əsir,
Hər kişvərə güzar elədi şəhriyari-elm.

Xurşidi-xavəri bürüdü zəngbar üçün,
Meydani-cəhli təng elədi şəhsüvari-elm.

Hər ildə gör zühurə gəlir bir qəribə şey,
Qıldı nihan sirləri aşkari-elm.

Bir şahbazi-fəthü zəfərdir ki, çərxdən,

Eylər kəbutərani-fünuni şikar elm.

Məğribzəmindən yürüdi xaki-Məşriqə,
Vurdu vağun qətarinə çünki məhari-elm.

Seyr eyləyir nəhəng kibi hər səfinə gör,
Bəhri-mühit səthinə düşmüş güzari-elm.

Tiri-şəhablər tökülür hər tüfəngdən,
Divi-şəriri rəcm eləyir namdar elm.

Cəhd eləyin, kəmalə yetib kamyab olun,
Getdi zəmani-cəhl, gəlib ruzgari-elm.

Fəyyaz idi, yetitşdi füyuzati-aləm,
Zülmati rəf' eylədi mehri-nigari-elm.

Çün cilvələndi aləmə gülçöhreyi-kəmal,
Gülzari-Qüds seyrinə gəldi həzari-elm.

*1907*

# MÜNDƏRİCAT

